# Kəlam Sifəti

Hüccətü'l-İslam imam əbu Həmid əl-Ğazzali, «İhya'u-Ulumi'd-din» əsərində, Allahın kəlam sifəti haqqında belə deyir:

• **Altıncı əsas:** Allah Taalanın kəlam sifətilə danışdığını bilməkdir. Allahın kəlam sifəti, Zatı ilə qaim bir özəllik olub səs və hərf növündən deyildir. Varlığı, başqasının varlığına bənzəmədiyi kimi; söz söyləməsi də, başqalarının söz söyləməsinə bənzəməz. Həqiqətdə, söz, nəfsin özüdür. Bəzi hərəkət və işarətlər, mənalara dəlalət etdikləri kimi, hərflərə çevrilən səslər də, nəfsdəki sözləri göstərirlər.

Cahil şairlərin belə fərq etdiyi bu halı, axmaq bir qrup, necə fərq edə bilmirlər, ki, kəlam sifətini inkar edirlər?! Bəli, bir şair belə deməkdədir:

«Şübhəsiz, söz, qəlbdədir; dil, qəlbin ifadə edicisidir.»

Ağıl və zəkası, özünü:

«Dilim hadisdir (sonradan var olmuşdur); ancaq hadis olan qüdrətimlə, dilimdə meydana gələn şey (yəni oxuduğum Quran), qədimdir.» deməkdən özünü əngəlləməyən şəxsin, ağlından ümidini kəs və onu, xitab edəcəyin şəxs qəbul etmə.

Qədimin: «özündən əvvəl heç bir nəsnə (şey) olmayan» demək olduğunu qavramayan və:

• bismillahdakı «bə» hərfinin, «sin» hərfindən əvvəl gəldiyini; və

• «sin» hərfinin, «bə» hərfindən sonra gəlməklə qədim ola bilməyəcəyini başa düşməyən şəxsi, diqqətə alma, belə birinə əhəmiyyət vermə. Çünki Allahın, bəzi qullarını irşad ilə Özünə yaxınlaşdırmaq,

bəzilərini də uzaqlaşdırmaq mövzusunda, bilə bilmədiyimiz bir çox sirləri vardır. Necə ki, bir ayətdə, Allah Taala, belə buyurur:

***«...Allahın azdırdığı kimsəni, doğru yola gətirəcək kimsə yoxdur.» (Ğafir/33)***

Musa (əleyhissəlam)'ın dünyada hərf və səs ünsürü daşımayan İlahi bir söz eşitdiyini mümkün görməyən, axirətdə də, cisim və rəng olmayan bir Varlığın (Allahın) görülməsini inkar etsin...

Əgər rəng, cisim, miqdar və kəmiyyət olmayan və bu vaxta qədər başqasına görülməyən bir şeyin görülə biləcəyini əql edə bilirsə, söz üçün düşündüyünü, qulaq üçün də düşünsün.

Əgər Allah Taala›nın bir elm sifəti olduğunu və bunun, bütün varlıqları bildiyi elm sifəti olduğunu düşünə bilirsə, bütün ibarələrilə dəlalət olunan və Allahın Zatına məxsus tək bir kəlam sifəti olduğunu da düşünməlidir.

Əgər:

• 7 qat göylərin, cənnət və cəhənnəmin varlıqlarının, kiçik bir yarpağa yazıldığını, qəlbin zərrə miqdarı bir yerində qorunduğunu;

• cənnət və cəhənnəmin:

bir toxum qədər olan göz bəbəyinə girmədikləri halda ordan göründüklərini; qəlbə girmədikləri halda, qəlbin ən kiçik küncündə qorunub saxlandığını; kağıza girmədikləri halda, kiçik bir kağızda yazıldıqlarını

əql edə bilirsə, deməк ki, İlahi kəlam:

• dillərlə oxunaraq;

• qəlblərdə hifz edilərək;

• Mushaflarda yazılaraq;

• kəlamın zatının, bura hulul etməsilə

***gerçəkləşmiş deyildir***. Çünki səhifələrdəki yazılara, kəlamın özü girsə idi, «Allah» ləfzinin kağıza yazılması sırasında, Allahın zatının bu kağıza girməsi lazım olardı.

Eyni şəkildə, «atəş» yazıldığında da, atəşin kağıza girməsi və bunun nəticəsində kağızın yanması, labüd olardı...

**• Yeddinci əsas:**

Allah Taalanın Zatı ilə qaim sifəti qədim olduğu kimi, digər bütün sifətləri də, qədimdir. Çünki Allahın, sonradan meydana gələn və dəyişikliyə uğrayan nəsnələrə (şeylərə) mahal olması, muhaldır (imkansızdır).

Doğrusu, Zatı üçün gərəkli olan qidəmlik sifətinin, sifətləri üçün də qaçılmaz olmasıdır. Dəyişmə halındakı şeylər, Ona ariz ola bilməz, sonradan olan nəsnələr, Ona girə bilməz. Allah Taala, ta əzəldən bəri, gözəl sifətlərin sahibi olduğu kimi, əbəddə də, dəyişməkdən münəzzəhdir. Çünki sonradan olan nəsnələrdə yer alan, bu hadis nəsnələrdən qurtula bilməz, hadis nəsnələrdən qurtula bilməyən isə, hadisdir. Cisimlərə sonradan var olma, yəni hudusluq özəlliyi, dəyişikliyə uğramalarından ötürü verilmişdir. Elə isə, cisimləri Yaradan, dəyişikliyi qəbullanmada, necə cisimlərə şərik ola bilər?

Bu əsas üzərinə:

***«Allah Taala, Zatı ilə qaimdir; hadis olan, bu kəlama dəlalət edən səslərdir.»***

hökmü bina edilir.

• Yenə bir atanın, hələ doğulmamış uşağı ilə bağlı olaraq, doğulub böyüdüyündə, özünə təhsil verdirəcəyini düşünməsini, belə bir arzu daşımasını,

• uşaq da doğulub, təhsil yaşına çatdığında, Allahın, atanın qəlbindəkilərə uyğun düşən bir elmi/biliyi, özündə (uşaqda) yaradıb, atası ilə qaim olan və özünün (uşağın) yetişməsinə/çatmasına doğru davam edən bu istəklə məmur qılınacağını

əqlə uyğun görən kimsə, Allahın:

***«Həqiqətən, Mən sənin Rəbbinəm. Başmaqlarını çıxart. Çünki sən müqəddəs Tuva vadisindəsən!»*** **(Taha/12)**

sözlərinin dəlalət etdiyi istəyinin də, Allahın zatı ilə qaim olub, Musa peyğəmbərin yaradılmasından sonra bu istəyi başa düşə biləcək bir biliyin özündə yaradıldığını, bu əmrə muxatab olub Allahın qədim olan kəlamını dinlədiyini də, əqlə uyğun görməlidir[1].

---

1 (1-ci cild, 2-ci kitab, 3-cü bölmə: «Əqidə qaydaları»)

***«Allah insanla ancaq vəhylə və ya pərdə arxasından danışır, yaxud bir elçi göndərir və o da, Allahın izni ilə Onun istədiyini vəhy edir. Həqiqətən, O, Ucadır, hikmət sahibidir.»*** **(Şura/51)**

## Təfsiri:

Bil ki, Allah Taala, qüdrətinin, elminin və hikmətinin mükəmməlliyini (Şura surəsi 49 və 50-ci ayətlərdə) bildirincə, bunun ardından, peyğəmbərlərlə necə danışıb vəhy etdiyini bildirmişdir.

Ayətlə bağlı bir neçə məsələ vardır:

## Birinci məsələ:

Bu ayətin mənası belədir:

«Allah insanlarla ancaq bu 3 şəkildə danışır:

**Vəhy yolu ilə**, ki, bu vəhydən məqsəd, qəlbə atılan ilham, yaxud da yuxudur. Necə ki, Allah Taala, Musa (əleyhissəlam)'ın anasına və oğlunu kəsməsi üçün İbrahim (əleyhissəlam)'a bu 3 şəkildə vəhy etmişdir.

Mücahidin belə dediyi rəvayət edilmişdir:

***"Allah Taala Zəburu, Davud (əleyhissəlam)'a, qəlbinə vəhy edərək endirmişdir."***

**Allah, Öz kəlamını, hər hansı bir elçi vasitə qılmadan, peyğəmbərə, bir-başa eşitdirir** ki, bu da vəhydir. Bunun dəlili, Haqq Taalanın, Musa (əleyhissəlam)'a vasitəsiz olaraq eşitdirdiyi kəlamına, "vəhy" demiş olmasıdır. Çünki Allah Taala:

***"...vəhy olunana qulaq ver."*** **(Taha/13)** buyurmuşdur.

Allahın peyğəmbərə, mələklərdən olan bir elçi göndərir və bu mələk, Allahın vəhyini, insan olan peyğəmbərə təbliğ edir.

Bu xüsusu, həsr yolu ilə ifadə edərsək, belə deyilə bilər:

Allahdan olan vəhyin insana çatması, ya bir təbliğ edici vasitə qılınmadan, yaxud belə bir təbliğ edici vasitə qılınaraq olur.

**Birincisi:** yəni Allahın vəhyinin bir vasitə qılınmadan peyğəmbərə çatması haqqında bu deyilə bilər:

• Eşitmədiyinə gəlincə, bu, ***"...ancaq vəhy ilə..."*** ifadəsindən;

• İkincisinə, yəni İlahi vəhyin peyğəmbərə bir şəxs (mələk) vasitə qılınmadan çatıb, ancaq peyğəmbərin Allahın kəlamının şəxsən özünü eşitməsinə gəlincə, bu da, ***"...bir pərdə arxasından..."*** ifadəsindən;

• Üçüncüsünə, yəni peyğəmbərə İlahi vəhyin bir vasitə ilə çatmasına gəlincə, bu da, ***"...yaxud bir elçi göndərib və o da Allahın izni ilə Allahın istədiyini vəhy etməsi..."*** ifadəsindən başa düşülməkdədir.

Bil ki, bu 3 qisimdən hər biri, vəhydir. Lakin Allah Taala, birincisinə "vəhy" ismini vermişdir. Çünki qəlbdə ilham yolu ilə meydana gələn şey, bir anda meydana gəlir. Dolayısı ilə, vəhy ləfzini, bunun üçün istifadə etmək, daha əvladır.

Bax bu qisimləri bir-birindən ayırıb ortaya qoymaq xüsusundakı sözümüz, bundan ibarətdir.

## İkinci məsələ:

Allah Taala, məkandan münəzzəhdir! Allah Taalanın bir məkanda

olduğunu söyləyənlər, ayətdəki: ***"...bir pərdə arxasından..."*** ifadəsini dəlil gətirmişlərdir. Çünki ayətin təqdiri mənası:

"Allah, insanla ancaq bu 3 şəkildə danışır:

**Bir pərdə arxasında olaraq**...şəklindədir. Bu söz, Allah Taalanın ancaq bəlli bir yer və yöndə olması halında doğru olur. Buna, bu şəkildə cavab veririk:

Ayətin zahiri, hər nə qədər siz mücəssimə'nin iləri sürdüyü mənanı ağla gətirsə belə, əqli və nəqli dəlillər, Allah Taalanın, bir yer və yöndə olmasının imkansızlığına dəlalət etməkdədir. Bundan dolayı, ayətin bu ifadəsini, buna görə təvil etmək lazımdır. Bu, bu mənadadadır:

Bir kimsə, danışanı görmədiyi halda, sözünü eşidib dinlədiyində, bu hal, o kimsənin, sanki bir pərdə arxasından danışmasına bənzəyir. Bax bu məcazi mənanın bəhs mövzusu olmasının səbəbi, belə bir bənzərlikdir.

**Ayət, Ruyətullah'ı (Allahı görməyi) əngəlləməz:**

Mötəzilə belə deyir:

***"Bu ayət, Allah Taalanın görülə bilməyəcəyinə dəlalət edər. Çünki Allah Taala, vəhyinin bu 3 şəkildə olduğunu bildirmişdir. Bundan dolayı, əgər Allah, görülə bilsəydi, qulu, Onu gördüyü halda, Allahın qulları ilə danışması mümkün olardı. Beləcə də, bu, 3 növə əlavə: 'Mən, insanlar ilə, ancaq bu 3 şəkildə danışıram...'***

***deмək surətilə, 4-cü qismin olmadığını bildirmişdir."***

Buna, bu şəkildə cavab veririk:

Biz (əhl-i sünnət), ayətin ləfzinə bir qeyd qoyuruq. Bu halda, ayətin mənası:

***“Allah, dünyada insanlarla ancaq bu 3 tərzdə danışır.”*** şəklində olur. Buna görə də, sizin irəli sürdüyünüz şeyə mahal qalmır. Belə bir qeyd qoymaq, hər nə qədər ayətin ifadə etdiyi mənanın əksinə olsa da, bu ayətlər ilə, Allah Taalanın qiyamət günü görülə biləcəyini ifadə edən ayətlərin arasını təlif edib birləşdirmək üçün gərəklidir. Allah, ən doğru biləndir...

**Allahın kəlam sifəti:**

Muhamməd ümməti, Allah Taalanın kəlam (danışmaq) sifəti olduğu xüsusunda, ittifaq etmişlərdir. İmam Əşari və tərəfdarlarının xaricindəkilər, Allahın kəlamının, bax bu eşidilən hərflər və birləşdirilmiş səslər olduğu xüsusunda müttəfiqdirlər.

Ancaq imam Əşari və tərəfdarları, Allahın kəlamının, bax bu (bildiyimiz) hərflər və səslər ilə ifadə edilən, qədim bir sifət olduğunu söyləmişlərdir.

**Birincilər:** yəni Allahın kəlamının bu hərflər, kəlimələr və səslərdən ibarət olduğunu söyləyənlər də, öz içlərində 2 qrupdurlar:

Bu hərflərin və səslərin də qədim olduğunu söyləyən HƏNBƏLİ’LƏR, ki, bunları ağıllılardan saymağa dəyməz.

Bir gün onlardan birinə təsadüf etdim və belə dedim:

“Allah Taalanın bu hərfləri, ya tək bir dəfədə, yaxud da ard-arda danışmış olduğunu fərz edək:

• Birinci ehtimal, bəhs mövzusu ola bilməz. Çünki bütün bunları tək bir dəfədə danışmaq, tərkib edilmiş- sıra ilə düzülmüş olan nəzmi, ifadə etməz. Bundan dolayı, ard-arda olan hərf və səslərdən mürəkkəb

(tərkib edilmiş, meydana gəlmiş) bu nəzmin, Allahın kəlamı olmaması gərəkdir.

• İkinci ehtimal da batildir. Çünki Allah Taala, əgər bu hərfləri ard-arda danışmış olsaydı, bunlar (biri, o birindən sonra gəlməsi cəhətilə) muhdəs olmuş (sonradan meydana gəlmiş) olarlardı.

O (hənbəli), bu sözü eşidincə:

***"Bizə düşən, inanıb keçməkdir. Yəni Quranın qədim olduğunu qəbul edib, eşitdiyimizə uyğun olaraq inanıb, bu söz üzərində dayanmamaqdır."***dedi.

Beləcə, bunu söyləyən kimsənin, qəlbinin təslimiyyətinə heyran qaldım.

Bu işin əhli olan kimsələrə gəlincə, onlar, bu hərflərin və səslərin, mövcud deyilkən, yox ikən meydana gəldikləri xüsusunda mütabiqdirlər (bir-birinə müvafiqdirlər). Onlar:

***"Bu hərflər, məxluqdurlarmı, yoxsa belə deyilməyib tam əksinə, bunlar hadisdirlərmi (sonradan meydana gəlmişlərdirmi)? Yaxud bunlar, başqa bir ifadə ilə, ifadə edilə bilərlərmi?"*** şəklində, bu xüsusda, fərqli-fərqli ifadələr istifadə etmişlərdir.

Yenə onlar:

***"Bu hərflər, Allah Taalanın zatı ilə qaimdirlərmi? Yoxsa Allah bu hərfləri, başqa bir cisimdənmi yaratmışdır?"*** şəklində də ixtilaf etmişlərdir.

• **Birincisi:** Kərramiyyə›nin;

• **İkincisi:** Mötəzilə›nin görüşüdür.

• Allah Taalanın kəlamının, bu ləfz və ibarələrin özünə dəlalət etdiyi

qədim bir sifət olduğunu iddia edən Əşarilər, Allah Taalanın:

***“...bir pərdə arxasından...”*** ifadəsindən, mələk ilə peyğəmbərin, hərflərdən və səslərdən münəzzəh olan o kəlamı, bir pərdə arxasından eşitdiyi xüsusunda ittifaq edərək, belə demişlərdir:

***“Allah Taalanın Zatının bir cisim olmadığı və bir məkanda olmadığı halda, Zatının görülməsi imkansız bir şey olmadığına görə, hərf və səs olmadığı halda, kəlamullahın eşidilməsində, hansı imkansızlıq bəhs mövzusu ola bilər?”***

Əbu Mansur əl-Maturidi əs-Səmərqandi də, Allah Taalanın, Zatı ilə qaim olan bu sifətin eşidilməsinin imkansız olduğunu; eşidilən şeyin isə, Allah Taalanın, o ağacda yaratdığı hərflər və səslər olduğunu iddia etmişdir ki, bu görüş, Mötəzilənin görüşünə yaxın bir görüşdür. Allah, ən doğrusunu biləndir...

## Altıncı məsələ:

(Bir başa) Allahdan olan vəhyin, bir başqa şəxsin vasitəsilə olmadığı sabit olub, hər vəhyin bir başqa şəxs vasitəsilə meydana gəlmiş olması da, imkansızdır.

Əks halda, ya «təsəlsül», ya da «dövr»[1] gərəkdir ki, hər ikisi də

1 **Təsəlsül:** Allah Taalanın varlığının lazım (zəruri) olduğunu isbat etməkdə istifadə edilən dəlillərdən biridir. Hadis (sonradan var olan) şeylərin, bir-birinin varlığına səbəb olaraq, geriyə doğru sonsuzluğa qədər zəncirləmə bir şəkildə davam etməsidir.

**Dövr:** Kəlam elmində, iddianın dəlilə və dəlilin iddiaya əlaqəli olması ilə, hökmün dönüb dolaşıb yenə əvvəlki halına qayıdaraq, həll oluna bilməməsidir.

Bu metodda, bir şeyin bir başqa şeyi yaratdığı, o yaradılan şeyin də, təkrar qayıdıb özünü yaradan şeyi yaratdığı fərz edilərək, bunun imkansız olduğu və əşyanın, sadəcə

muhaldır (imkansızdır).

Bundan dolayı, bir başqa şəxs vasitə olmadan da, vəhyin mütləq olaraq meydana gələ biləcəyini mütləq qəbul etmək lazımdır.

İndi, burda, belə bir neçə bəhs ortaya çıxmaqdadır:

**Peyğəmbərin səsi təşxisi:**

**• Birinci bəhs:**

***Bir başqa şəxs vasitə olmadan, Allahın vəhyini dinləyən bu peyğəmbər, dinlədiyi o kəlamın, "kəlamullah" olduğunu necə ayırd edəcəkdir?***

İndi əgər biz:

***"O, hərf və səsdən münəzzəh olan o qədim sifəti eşitmişdir."*** deyərsək, o peyğəmbər, bu kəlamı dinlədiyində, onun kəlamullah olduğunu, zəruri olaraq bilmiş olması, imkansız olmaz.

Yenə:

***"O, bundan sonra bir başqa dəlilə möhtacdır."*** da, deyilə bilər. Ancaq biz, eşidilənin, hərflər və səslər olduğunu söyləyərsək, bu eşidilənin, kəlamullah olduğuna dəlalət edən bir dəlilin mövcud olması halı xaric, onun kəlamullah olduğu xüsusunda qəti bir qərar vermək, imkansız olar.

**Vəhyin tamamlanma mərtəbələri:**

**• İkinci bəhs:**

**"Peyğəmbər bu vəhyi mələkdən dinlədiyində, bu sözü təbliğ edənin, azdıran şeytan deyil, məsum mələk olduğunu necə bilir?"**

---

Allahın iradə və qüdrətilə varlıq qazandığı, izah və isbat edilir.

Həqiqət budur ki, o peyğəmbər, bunu, qəti bir şəkildə, ancaq, ona vəhyi təbliğ edənin xəbis şeytan deyil, məsum bir mələk olduğuna dəlalət edən bir möcüzəyə dayanaraq, bilə bilər. Belə olması halında isə, Allahdan olan İlahi vəhy, ancaq möcüzə zühurundakı bu 3 mərtəbə ilə tamamlanır:

**Birinci mərtəbə:**

Mələk, o kəlamı Allahdan aldığında, mələklər üçün bu kəlamın, kəlamullah olduğuna dəlalət edən bir möcüzənin təhəqquq etməsi (gerçəkləşməsi) lazımdır.

**İkinci mərtəbə:**

Bu mələk, peyğəmbərə vasil olduğunda, yenə peyğəmbər üçün, mütləq bir möcüzənin mövcud olması, gərəkdir

**Üçüncü mərtəbə:**

Peyğəmbər o vəhyi, ümmətinə çatdırdığında, yenə o peyğəmbər üçün bir möcüzənin olması lazımdır.

Beləcə, mükəlləfiyyətin, insanlara, ancaq möcüzələrdəki bu 3 mərtəbədən sonra təvəccüh etdiyi sabit olmuş olur.

**Vəhy mələyi Cəbrail:**

**• Üçüncü bəhs:**

Mələklərdən hər hansı birinin, bu vəhyi, doğrudan-doğruya Allahdan aldığında, şübhə yoxdur. O halda, bu mələk, Cəbrail (əleyhissəlam)'dır. Cəbrailin bu vəhyi, bir başqa mələkdən aldığı da söylənə bilər. Vələv ki, arada bir vasitə olsun, bütün bunlar, ehtimal daxilindədir. Bunlardan hər hansı birinin qəti olduğuna dəlaalət edən hər hansı bir şey yoxdur.

**Vasitəsiz vəhy:**

**• Dördüncü bəhs:**

***"Bəşər arasında, hər hansı bir vasitə olmadan, doğrudan-doğruya (bir başa) Allahdan vəhy alan vardırmı?"***

Məşhur olan, Musa (əleyhissəlam)'ın, kəlamullahı, arada hər hansı bir vasitə olmadan, dinləmiş və eşitmiş olmasıdır. Bunun dəlili:

***"...Vəhy olunana qulaq ver."*** **(Taha/13)** ayətidir.

Allah Taalanın:

***«Sonra Allah Öz quluna nazil edəcəyini vəhy etdi.»*** **(Nəcm/10)** ayətinə dayanılaraq, Muhamməd (sallallahu aleyhi və səlləm)'in də, bir başa vəhy aldığı iləri sürülmüşdür.

**• Beşinci bəhs:**

Mələklər, fərqli-fərqli şəkillərə girib özlərini elə göstərə bilirlər. Peyğəmbər, hər dəfəsində, o mələyi gördüyünün qəbul edilməsi halında, bu dəfə gördüyünün, ilk dəfədə gördüyünün eynisi olduğunu bilə bilməsi üçün, bir möcüzəyə ehtiyac duyular.

Əgər peyğəmbər, onun şəxsini görməzsə, səsdə bir bənzərliyin meydana gəlmiş olması ehtimalından dolayı, bu halda, möcüzəyə duyulan ehtiyac, daha çox olar. Ancaq nə var ki, hər dəfəsində, möcüzənin izhar edilməsinə duyulan ehtiyac mövzusunda bir problem olduğunu da, heç kim söyləməmişdir.

**Allahın şeytana xitabı:**

***"Quranda, Allah ilə iblis arasında keçdiyi zikr edilən münazirə,***

***Allah Taalanın, hər hansı bir vasitə olmadan, iblis ilə danışdığına dəlalət etməkdədir. O halda, bu,***

***Allahdan iblisə bir vəhy olaraq isimləndirilə bilərmi? İsimləndirilə bilməzmi?"***

Görünən odur ki, buna vəhy deyilə bilməyəcəyidir. Bu mövzuda, mütləq, dərin və mükəmməl bir tədqiqat aparmaq, qaçılmazdır.

Haqq əhlinə (hüccət və bürhanlarla, özlərini, Rəbləri qatında ən haqq (doğru) olana nisbət edənlərə, əhl-i sünnətə) görə, doğru olan budur:

***"Mələk, vəhyi təbliğ etdiyində, şeytan, bu vəhy arasına batil şeylər əlavə etməyə, müqtədir ola bilməz."***

Bəziləri:

***«Biz səndən əvvəl elə bir elçi, elə bir peyğəmbər göndərməmişik ki, o, ayələrimizi oxumaq istədikdə şeytan onun oxuduğuna gizlicə vəsvəsə verməsin. Lakin Allah*** **şeytanın gizlicə təlqin etdiyini yoxa çıxarar. Sonra da Allah Öz ayələrini möhkəmlədər. Allah Biləndir, Müdrikdir.» (Həcc/52)** ayətinə istinad edərək, bunun, mümkün ola biləcəyini irəli sürmüş və:

***"Şeytan, Nəcm surəsinin ayətləri arasına:***

***'Bunlar (bütlər), uca varlıqlardır. Onlardan şəfaət gözlənər.'*** ibarəsini əlavə etdiyini söyləmişlərdir.

Dostumuz Məlik Sam ibn Muhamməd -ki, səltənət sahiblərindən (Allah dostlarından), qarşılaşdıqlarım arasında ən əfdalıdır- belə deyərdi:

«Çox güclü dəlillərin mövcudluğundan sonra, belə bir söz, bu 2 cəhətdən batildir:

Peyğəmbər (sallallahu aleyhi və səlləm):

***«Kim yuxusunda Məni görərsə, o həqiqətdə Məni görmüşdür. Çünki şeytan, Mənim surətimə girə bilməz.»*** buyurmuşdur. Bundan dolayı, şeytan, yuxuda, peyğəmbərin surətinə girməyə müqtədir ola bilmədiyinə görə, daha necə Allahın vəhyini təbliğlə məşğul olduğu bir sırada, Cəbrail (əleyhissəlam)'a bənzəməyə müqtədir ola biləcəkdir?!

Nəbi (sallallahu aleyhi və səlləm):

***«Ömər, bir yola girməli olsa, şeytan, mütləq yolunu dəyişdirər, başqa bir yola girər.»*** buyurmuşdur. Bundan dolayı, şeytan, eyni yolda Ömər (radiyallahu anh)'la birlikdə olmağa müqtədir ola bilmədiyinə görə, daha necə, Allahın vəhyini təbliğ etdiyi bir yerdə, Cəbrail (əleyhissəlam) ilə bərabər ola bilər, buna güc çatdıra bilər?»

**• Onuncu məsələ:**

Ayətdəki: ***«...Bu mələk, Allahın iznilə, Allahın istədiklərini vəhy edər...»***

deməkdir ki, bu ifadə:

• gözəlin, lizatihi (öz zatında, zatı etibarı ilə) gözəl;

• çirkinin isə, öz zatında çirkin olmayıb tam əksinə, hər hansı bir təxsis olmadan, Allahın, istədiyi şeyləri əmr etmək, yenə hər hansı bir təxsis bəhs mövzusu olmadan, istədiyi şeylərdən də nəhy etmə səlahiyyətinə sahib olmasını iqtiza edər (gərəkdirər). Çünki əgər hal belə olmasa idi, o vaxt, Allah Taalanın ***«istədiyini»*** ifadəsi, yerində və doğru olmazdı. Allah, ən doğrusunu biləndir...

Daha sonra, Allah Taala, ayətin sonunda buyurmuşdur ki, bu:

***«O, məxluqatın sifətlərindən münəzzəh, fellərini, hikmətinin***

***gərəyinə görə icra edən, beləcə də, bəzən arada bir vasitə olmadan ilham yolu ilə, bəzən sözünü eşitdirmək surətilə, bəzən də kərim mələyini vasitə qılmaq surətilə danışan müdrikdir (hikmət sahibidir).»*** deməkdir[1].

1 **Fəxrəddin ər-Razi,"Məfatihu'l-Ğeyb" təfsiri**

# VƏHY

**A. Vəhy, Vəhyin növləri:**

Dini ədəbiyyatda **vəhy**: *Allahın qulları arasından seçdiyi elçilərinə, istədiyi hidayət və elmi/biliyi, insanların adət etmədiyi tərzdə, gizli bir yolla, bildirməsi mənasına gəlir.*

Vəhy, fərqli şəkillərdə meydana gəlir. Bunları, bu şəkildə sıralamaq mümkündür:

**1. Qul ilə Rəbbi arasında meydana gələn danışmaq şəklində.** Necə ki, Allah Taala Musa (əleyhissəlam) ilə bu şəkildə danışmışdır.

**2. İlham şəklində**. Allah Taala, bu ilhamı, seçdiyi qulunun qəlbinə göndərir. Bu ilham, zəruri elm/bilik şəklində olur, nə əngəllənə bilir, nə də özündən ən kiçik şübhə edilir.

**3. Doğru (saleh) yuxu şəklində.** Bu cür yuxular, sabahın aydınlığı şəklində reallaşır.

**4. Cəbrail vasitəsilə.** Cəbrail, çox güclü, uca Allah qatında çox etibarlı, özünə itaət edilən və güvənilən, dəyərli bir mələkdir. Bu şəkildə gələn vəhy, ən çox bilinən və ən çox gələn vəhy növü idi. Quran vəhyinin bütünü, bu şəkildə gəlmişdir. Termin olaraq, cəli (açıq-aşkar) vəhy şəklində ifadə edilir. Allah Taala, ***Şuara surəsinin 193-195***-ci ayətlərində belə buyurmaqdadır:

***«Onu sadiq Ruh (Cəbrail) endirdi –sənin qəlbinə ki, xəbərdar edənlərdən olasan. Bu Quran açıq-aydın ərəb dilində nazil edildi.»***

Vəhy mələyi, Allah rəsulu (sallallahu aleyhi və səlləm)’ə fərqli

şəkillərdə gələrdi:

• bəzən mələk olaraq yaradıldığı əsli surətində;

• bəzən Peyğəmbərin ətrafında olan insanların görüb-eşidəcəyi şəkildə bir insan (Dihyə) surətində;

• bəzən də görünmədən gizlicə

enərdi. Ancaq o gəlincə, Peyğəmbərdə fərqlilik halı ortaya çıxırdı.

Məsələn, Muhamməd (sallallahu aleyhi və səlləm), yatan biri kimi xorlayır, sanki özündən getmiş, ya da yuxuya dalmış biri kimi, olduğu mühitdən uzaqlaşırdı. Lakin O, nə yuxuya dalır, nə də özündən gedirdi. Onun yaşadığı bu hal, özünü mələk ilə ruhani görüşə tamamilə verməkdən və normal bəşər təbiətindən sıyrılmaqdan başqa bir şey deyildi. Bunun da bədən üzərində bəzi təsirləri vardı.

Bu səbəblədir ki, Peyğəmbər (sallallahu aleyhi və səlləm), xorlayan biri kimi səs çıxardır və bədəni ağırlaşdıqca ağırlaşırdı. Çox soyuq günlərdə belə alnından tərlər boşalırdı. Vəhyin Peyğəmbər (sallallahu aleyhi və səlləm) üzərindəki təsiri, zilin çaldığı zaman, dinləyənlərin üzərində buraxdığı təsirə bənzəyirdi. Bax bu, vəhyin ən ağır olanı idi.

Bəzi vaxtlar da, vəhyin gəlişinə şahid olan səhabələr, Peyğəmbərin üzündən arı uğultusunu xatırladan bir səsin gəldiyini eşidirlərdi. Ancaq onlar, nə bir söz, nə də bir kəlimə eşidib başa düşürlərdi.

Allah rəsulu (sallallahu aleyhi və səlləm) isə, özünə vəhy edilənləri eşidir, əzbərləyir, hər hansı bir şübhə və ya qarışıqlıq olmadan, bunun Allahdan gələn vəhy olduğunu, zəruri bir elm/bilik olaraq bilirdi. Özünə vəhy edilməsi bitincə, verilən vəhyi yaddaşına nəqş edilmiş şəkildə hazır görürdü. Sanki vəhy, Onun qəlbinə yazılırdı.

Bu bildirdiklərimizin kitab və sünnətdən bir çox dəlili vardır. Bunların bir qismini, Quranın nüzul (eniş) müddətindən danışarkən, verdik. Bir dəlil də, bu ayətdir:

***«O, öz həva və həvəsilə danışmır. O, özünə vəhy edilən bir vəhydən başqa bir şey deyildir.» (Nəcm/3-4)***

Bir digər dəlil də, Buxarinin, möminlərin anası Aişə'dən nəql etdiyi bu hədisdir:

Haris b. Hişam, Nəbi (sallallahu aleyhi və səlləm)'ə:

***«Ey Allahın rəsulu! Sənə vəhy necə gəlir?»*** deyə soruşdu. Peyğəmbər (sallallahu aleyhi və səlləm) belə cavab verdi:

***«Bəzən Mənə, vəhy, zil səsi şəklində gəlir. Bu, vəhyin ən ağır olanıdır. Mələk, Məndən ayrıldığı vaxt, onun nə dediyini tamamilə əzbərləyirəm. Bəzən də Mələk, Mənə bir adam şəklində görünüb Mənimlə danışır. Mən də, onun nə dediyini tamamilə əzbərləyirəm.» (Buxari, Bədiu'l-vəhy, 2)***

Aişə (radiyallahu anha) belə deyir:

***"Peyğəmbər (sallallahu aleyhi və səlləm)'ə çox soyuq gündə vəhy gəldiyini gördüm. Alnı, qan-tər içində ikən, mələk ondan uzaqlaşardı." (Buxarı, Bədiu'l-Vəhy, 1)***

**B. Elmi cəhətdən vəhy:**

Vəhy düşmənləri ilə vəhyi inkar edənlərin dinə və dini dəlillərə inanmadıqları, mütləq göz önündə tutulmalıdır. Onlar, uyğun gördükləri metodla, ağla və müasir terminologiyalarında həmfikir olduqları elmə/biliyə inanırlar. Bu elm/bilik də, müasir tədqiqat metodlarının varlıq

və kainat haqqında ortaya qoyduğu qəti məlumatların bütünüdür. Müasir tədqiqat, şübhəni, apardıqları tədqiqatın mərkəzinə qoyur və sadəcə hissin dəstəklədiyi dəlilə dayanır. Onlar, ilk əvvəl şübhəni irəli sürür, sonra bunu dərinləməsinə incələyirlər. Ən sonunda, sadəcə hiss edilən şeyləri qəbul edir, əqli mövzulara əhəmiyyət vermirlər. Bax bu nöqtədə, özlərini maddəyə həbs etmiş, bir müddət maddənin xaricində nə varsa, inkar etmiş, şübhələrində isə, ən son nöqtəyə qədər israr etmiş, ən qaranlıq cahiliyyə çağlarının belə çata bilmədiyi şəkildə, ilahiyyat, nübüvvət və vəhy mövzularını, əhəmiyyətsiz görmüşlərdir. Əgər şəxsən elm -irəlidə açıqlayacağımız üzərə- maddənin fövündəki hər şeyi inkar mövzusunda daşıdıqları görüşlərini dəyişdirəcək qədər, özlərini sarsmasaydı, onlar, bu hal üzərə davam edəcəklərdi.

Bu bölmədə, vəhyin elmi dəlillərindən mövzuya giriləcəkdir. Çünki hal-hazırda, bunlar, vəhyin mümkün olduğu və onu zehinlərin idrakına yaxınlaşdırma mövzusunda olan dəlillərdir. Vəhyin imkan daxilində olduğunun ortaya qoyulması, bu mövzuda atılacaq ilk addımdır. Bu, bir az sonra gələcək olan əqli dəlilin müqəddiməsində diqqətə alınan xüsusdur. O halda, bu elmi dəlillərin ilk əvvəl ələ alınmasında heyrət ediləcək bir hal yoxdur.

### 1. Hipnoz:

Hipnoz, qəbul edilən elmi həqiqətlərdəndir. İlk olaraq, alman doktor-Mesmer tərəfindən XVIII əsrdə ortaya qoyulmuşdur. Mesmer və onun yolunu izləyən elm adamları, tam bir əsr boyunca, bunu isbat etmək və elm adamlarının bunu qəbul etməsini təmin etmək üçün çalışmış və bu mövzuda müvəffəq olmuşlardır. Sonunda, elm adamları, minlərcə insan üzərində bunu təcrübə etdikdən və bu mövzudakı testlərinə

güvəndikdən sonra, elmi olaraq bunu qəbul etmişlərdir. Bunun nəticəsində, bunların da həqiqət olduğunu ifadə etmişlərdir.[1]

**a.** İnsanın bilinən ağlından, çox daha yaxşı olan daxili ağlı vardır.

**b.** Hipnoz əsnasında, insan, çox uzaq məsafədən görür və eşidir, pərdə arxasından oxuyur, hislər dünyasında, reallaşması üçün hər hansı bir əlamətin olmadığı hadisələrin meydana gələcəyini xəbər verir.

**c.** Hipnozun mərhələləri vardır. Daxili ağıl, bu mərhələlərdə ilərləyərkən, getdikcə yüksəlir.

**d.** Hipnozda, test edilən şəxsin ruhunun, bədənindən ayrılacağı və ruhu, bədənin yanında görünmədən dayanacağı dərəcəyə qədər çata bilir. Bu halda, bədən, ölümə bənzəyən bir halda olur. Ölümdən tək fərqi, bədən ilə ruh arasındakı gizli münasibətdir.

**e.** Elm adamları, hipnoz sayəsində, ruhun varlığını ortaya qoymuşlardır.

**f.** Ruh, bədəndən tamamilə azaddır.

**g.** Bədənin yox olması ilə, ruh yox olmaz.

**h.** Ruh, maddədən sıyrılınca, özündən əvvəl yaşamış ruhlarla münasibət qura bilir.

---

1 Burda müəllif- Zürqani, peyğəmbərin mələ-i ala (çox uca mənəvi aləm) ilə olan rabitəsindən ibarət olan vəhyi, hipnozda, hipnoz edən şəxslə təcrübədən keçən şəxsin ruhlarla rabitə qurması ilə açıqlamaq istəmədiyini, mütləq bildirməyimiz lazımdır. Çünki müəllif, bu nümunəni verməklə, müasir materialist ağlı, dirilərlə ölülər arasındakl rabitənin, elmə görə hərəkət edən ağıl tərəfindən inkar edilmədiyinə, hətta elmin, belə bir rabitənin gerçəkləşdiyinə dəlil gətirdiyinə inandırmaq surətilə, vəhyin başa düşülməsini asanlaşdırmaq istəmişdir.

Elm adamları, burda təqlidə qapılıb bütün təfərrüatlarını qəbul etməyəcəyimiz başqa nəticələr də varmışlardır. Ancaq ümumi mənada bu elmi, təcrübələrini və çatdığı nəticələri qəbul etməkdəyik. Çünki fərqli testlər və müşahidələr nəticəsində, ümumi olaraq, bunları dəstəkləyən dəlillər mövcuddur. Qərbdə, bunun tərəfdarı olan elm adamları və tələbələr vardır. Bu elmin mərkəzləri, nəşr evləri və insanların müalicə olmaq üçün baş vurduqları klinikaları vardır.

Mövzumuz, bu elm, bu elmin tarixi, testləri və faydaları haqqında detallı məlumat vermək deyildir. Ancaq burda, oxuyucuya, bu mövzuda ümumi bir fikir vermək məqsədi güdülmüşdür. Bu da ona, Allah Taalanın, bu əsrdə, maddənin fövqündə nə varsa inkar edən təbiətpərəstlərin əli ilə nə qədər möhtəşəm dəlillər çıxardığını göstərir. Çünki onlar, maddənin fövqündə bir həqiqət olduğunu qəbul edib bunu isbat nöqtəsində əllərindən gələni edərlərkən, Allahın bir nemətini əldə etmişlərdir. Beləcə, Allahın bu sözünün nə qədər haqlı olduğunu göstərmişlərdir:

***"Quranın haqq olduğu onlara aydın olana qədər, Biz dəlillərimizi onlara həm kainatda, həm də onların özlərində mütləq göstərəcəyik. Məgər Rəbbinin hər şeyə şahid olması kifayət deyil?" (Fussilət/53)***

Burda, hipnozun, vəhyin anlaşılmasını asanlaşdıracağı testlərindən birinə yer verəcəyik. Bu testə, şəxsən gözlərimlə şahid oldum, o an danışılanları, şəxsən qulağım ilə eşitdim. Bu test, Müsəlman Gənclər Təşkilatı'nda, mədəni böyük bir izdiham qarşısında, hər kəsin görə biləcəyi və eşidə biləcəyi bir mühitdə reallaşdırılmışdı.

İnsanlar, hipnoz və hipnozun, şəxsin inancını və dinini dəyişdirmə mövzusunda, pis bir silah olaraq istifadə edilə biləcəyini isbatlamaq haqqında, əhəmiyyətli bir konfransa qatılmaq üçün gəlmişlərdi. Necə

ki, missionerlər, bu metoda baş vuracaq qədər alçalmışlardır. Hiyləgər düşmən, hicri 1351-ci ildə, ən seçgin müsəlman gənclərdən birini bu şəkildə, dinindən döndərmişdi. Bu qorxunc hadisə, hər kəs tərəfindən bilinməkdədir və bu hadisənin üzərindən, uzun zaman keçməmişdir.

Konfrans verən şəxs, hipnoz mütəxəssisi idi. Bu şəxs, üzərində test edəcəyi gənc bir şəxs gətirdi. Üzərində təcrübə aparılacaq gənc, hipnoz edəcək şəxsdən təsirlənmə özəlliyinə sahib idi. Hipnoz mütəxəssisi də, ona təsir edəcək gücə sahib idi.

Mütəxəssis, üzərində təcrübə apardığı şəxsin gözünə, dərin və təsirləndirici şəkildə baxdı. Onun üzərində, “sahabat” adını verdikləri bəzi hərəkətlər reallaşdırdı. Çox keçmədən test edilən şəxs, yuxulayan kimsə kimi, xorlamağa başladı, rəngi ağardı, bədəni hərəkətsiz hala gəldi, hislərini itirdi. Hətta içimizdən biri, dəfələrlə onun bədəninə iynə batırdı. Onun ardından ikinci və üçüncü şəxs də, ona iynə batırdı. Ancaq test edilən şəxs, nə hərəkət edir, nə də hiss və idrak etdiyinə dair kiçik bir reaksiya verirdi. Bax o vaxt, onun hipnoz edildiyini qəti olaraq başa düşdük.

Bu anda, hipnoz mütəxəssisi, onun üzərində hakimiyyət qurmağa başladı. Ondan adını soruşdu. Test edilən şəxs, əsl adını söyləyərək, xəbər verdi. Mütəxəssis, bu adın, onun həqiqi adı olmadığını söylədi və başqa bir ad uydurub ona:

***“Sənin adın budur.”*** dedi. Sonra təsdiq edər surətdə anlaşılmayan sözlər ilə müsbət və ya mənfi əmr şəklində ona yönləndirdiyi cümlələr sayəsində, test edilənin zehninə, bu əsli olmayan yeni adını yerləşdirdməyə və həqiqi adının izlərini silməyə başladı. Bu şəkildə, bu uydurma adı ona tətbiq etdi. Sonunda, o da, buna boyun əydi və tabe oldu.

Daha sonra, həm mütəxəssis, həm də biz, fərqli aralıqlarla və onun

qafil olduğu mövzu əsnasında, dəfələrlə ona həqiqi adı ilə səsləndik. Bunu, söz sırasında birdən birə təkrarladığımız da oldu. Ancaq boş yerə... O, bizə cavab vermədi. Uydurma adı ilə ona səsləndiyimiz vaxt isə, ən kiçik tərəddüd yaşamadan və durmadan həmin an, yerindəcə cavab verdi. Hipnoz mütəxəssisi, bu yeni adın, özünün həqiqi adı olduğunu və bunu, mütəmadi olaraq xatırlamasını əmr etdi. Bu hal, test edilən şəxs oyandıqdan sonra, yarım saatdan çox davam etdi. Mütəxəssis, bu gənci oyatdı və konfransı tamamlamağa başladı. Biz isə, gəncə, həqiqi adı ilə səslənməyə davam etdik. Ancaq o, bizə reaksiya vermədi. Digər adı ilə səsləníncə, bizə cavab verirdi. Müəyyənləşdirilən yarım saatlıq müddət başa çatdı və bu gənc, həqiqi adını bildiyi ilk halına döndü.

Bu təcrübə ilə hipnoz mütəxəssisi, bir insanın adı kimi nə qədər sabit olursa olsun, ya da dini inanc kimi nə qədər müqəddəs olursa olsun, hipnozun, insanın zehin dünyasından, silinmək istənən hər şeyi silməkdə istifadə edilə biləcəyini isbat etdi.

Bu mütəxəssis, dini deyil, adı silməyi, 2 səbəbdən dolayı tərcih etmişdi:

**a.** Dini yox etmək, çox pis düşmənlikdir, böyük bir yalnışdır. Tamaşaçılar bir yana, konfransı verən belə, bunu qəbul etməzdi.

**b.** Adın, insanın zehnində, dindən daha sabit olmasıdır. Dolayısı ilə, onu silmək, daha çox heyrət oyandırır. Burdan, dinin, insanın zehin və könül dünyasından çıxarılmasının daha asan olduğu başa düşülür.

Bu test sayəsində, mənim üçün, elmi bir yol ilə, praktiki cəhətdən, vəhyi başa düşməyimi asanlaşdıran; elmi olaraq da onun reallığını ortaya qoymağıma kömək edən dəlillər ortaya çıxmışdır:

Vəhy, mələk cəhətindən, mələyin, Peyğəmbər (sallallahu aleyhi və səlləm) ilə qurduğu rabitədir. Bu əlaqədə, birinci varlıq ikinci varlığa

təsir etməkdə; ikinci varlıq da, birinci varlıqdan təsirlənməkdədir. Hər iki halda da, bu, 2 varlıqdakı xüsusi qabiliyyətdən qaynaqlanmaqdadır. Belə ki:

Mələkdə- vermə və təsirləndirmə gücü vardır. Çünki o, tamamilə ruhanidir.

Peyğəmbərin isə- ari ruhaniyyatı, həm də mələyin təmizliyinə uyğun qəlb və zehin paklığı sayəsində alma qabiliyyət vardır.

Mələyin peyğəmbərə hökm etmə əsnasında, Peyğəmbər, normal haldan sıyrılır, bunun izləri onda görünür, tamamilə özünü mələkdən vəhyi almağa verir və aldıqları, qəlbinin səhifələrinə yazılmışcasına zehnində hazır hala gələrək, yaddaşında eynilə əzbərlənirdi.

Bir insan, hipnoz sayəsində bir varlığın başqa bir varlığa bu şəkildə təsir edəcəyini düşünüb qəbul edirsə, bütün güclərin sahibinin (Allahın) vəhy vasitəsilə qullarından istədiyi birinin daxili dünyasına təsir edəcəyinə necə ehtimal verməyə bilər?!

Buna ehtimal verməmək, əsla və əsla mümkün deyildir... Çünki Allah Taalanın, istədiyini etməyə gücü çatır... **(Əhqaf/33)**

### 2. Elmi kəşflər:

Müasir elm, telefon, mikrofon və radio kimi bildiyimiz, müşahidə etdiyimiz və faydalandığımız heyrət verici kəşfləri reallaşdırmağı bacarmışdır. Bu kəşflər sayəsində, insan, uzaq diyarlardakı kimsələrlə rabitə qurmaq, onlara istədiklərini bildirmək və onları istədiklərinə yönləndirmək imkanına qovuşmuşdur. Bu maddi kəşflərdən sonra, hər şeyə gücü çatan Allahın, qullarından istədiyi birinə mələk vasitəsilə, ya da onun vasitəsi olmadan vəhy etməkdən aciz olduğu, düşünülə

bilərmi?! Şübhəsiz, Allah, inkar edənlərin söylədiklərindən çox münəzzəhdir...

### 3. Qrammafon:

Elm, cansız və elmdən/bilikdən yoxsul grammafonlara, səs, mahnı, Quran və daha başqa şeylər yükləməyi bacarmışdır. Qrammafon, böyük bir diqqət və ustalıqla, yüklənəni eynilə yansıdmaqdadır. Bu gün, əlimizdə, bunun çox nümunələri mövcuddur. Bunu inkar isə, mümkün deyil. Gözümüzün qarşısında canlı duran bu kəşflərdən sonra, hər şeyə gücü çatan Allah Taalanın, mələk vasitəsilə, ya da onun vasitəsi olmadan, seçgin qullarından saf təbiətli bəzilərinin qəlbinə, insanları hidayətə çatdıran və haqqı ortaya qoyan sözü, elçisinin diqqət və sağlamlıqla möhkəmləndirəcəyi şəkildə onun qəlbinə nəqş edəcək tərzdə yerləşdirməsi, uzaq bir ehtimal olaraq görülə bilərmi?!

### 4. Heyvanlar aləmindəki heyrət verici həqiqətlər:

Dünyadakı bəzi heyvanların heyrət oyandıran sistemlərə sahib olduqlarını və heyrət verən işlər gerçəkləşdirdiklərini müşahidə etməkdəyik. Bunların o heyvanlarda var olan bir düşüncədən, ya da bəsit bir instiktdən meydana gəldiyini söyləməyimiz, imkansızdır. Müşahidələrimiz, bütün bunların, o heyvanlara, bəhs mövzusu heyrət verici işləri, incəliyi və dahiliyi ilham və vəhy edən uca bir iradədən meydana gəldiyinə, qəti olaraq inanmağımızı, məcbur qılmaqdadır.

Heyvanlar aləminə aid bu xüsus doğru olduğuna görə, insan aləmində bunun doğru olması daha öncəliklidir. Çünki insanın uca üfüq ilə rabitə qurmaq qabiliyyəti, daha güclü; bu üfüqdən elm/bilik/

məlumat alması, daha asandır. Vəhy yolu ilə meydana gələnlər də, bu qəbildəndir. Bir az əvvəl, uca ilhamları mövzusunda zikr edilən heyvanlara bir nümunə istəyənlər, qarışqa və bal arısı ilə bunların etdikləri fərqli işlərə və tabe olduqları həssas sistemə baxa bilərlər. Bir də, elm adamlarının oxhexlob adını verdikləri qəribə bir heyvan vardır. Fransadakı Sourboun Universiteti üzvlərindən Milan Edward, bu heyvan haqqında belə deyir:

***“Oxhexlob adı verilən heyvanlar, tək başlarına yaşayırlar. Yumurtladıqlarında da, həmin an ölürlər. Bu heyvanların balaları, ayaqsız olaraq qurtcuq halında çıxır, özlərini də hər hansı bir vəhşi heyvana qarşı qoruya bilmirlər. Eyni şəkildə, özlərini bəsləməyə də gücləri çatmır. Bununla birlikdə, həyatları, qapalı bir mühitdə, tam sükunət içində, əskiksiz bir müddət yaşamağı gərəkdirir. Əks təqdirdə, bu heyvanlar, həlak olurlar.***

***Ana oxhexlob nə vaxt yumurtlaması gərəkdiyini bilir. Yumurtlama vaxtı gəlincə, bir odun parçasına yönəlir, uzunlamasına onda bir oyuq qazır. Oyuq qazmağı tamamlayınca, özü üçün yemək depolamağa başlayır. Az bir yemək, ona bir il boyunca bəs edir. Depolanan yemək, çiçək tozu ilə şəkər ehtiva edən bəzi yarpaqlardan meydana gəlir. Ana oxhexlob, bu yeməkləri, oyuğun girişinə yığır, ardından bura yumurtasını buraxır. Sonra ağac tozlarını gətirir və bundan bir xəmir yoğurur. Bu xəmiri, yumurtanın üzərinə tavan edir. Ardından, başqa bir yemək gətirib tavan’ın üzərinə qoyur. Sonra bir yumurta daha yumurtlayır. Yumurtaları bitənə qədər, bu şəkildə davam edir. Ən sonunda, hamısını orda qoyub can verir.”***

Bu zəif həşərata, ağılları heyrətə salan bu işi görməyi, kim öyrətmiş ola bilər? Özü yumurtladıqdan sonra ölərkən, doğacaq uşaqlarının acizliyini və ehtiyac içində bir il qalacaqlarını, ona kim bildirmişdir?

Yumurtacıqlarını, yumurtlamaq üçün, bütün bu çətinliklərlə mücadilə edəcək qədər, öz növünə bu qədər əhəmiyyət vermək düşüncəsini, onun qəlbinə kim yerləşdirmişdir?

Heç şübhəsiz, bütün varlıqları var edən, qoruyub idarə edən uca Allah, onlara, özlərini ayaqda tutacaq və öz faydalarına olan bu bilikləri, hislər xaricində başqa bir yolla verməkdədir.

Onlar, bu hislər vasitəsilə, o biliyə əsla çata bilməzlər. Təbiətçi bəzi tədqiqatçıların, İlahi gücün, ən kiçik həşəratlara verdiyi ilhamı qəbul edib, ardından fərdi və sosial həyatında bu cür ilham və vəhylərə hər kəsdən daha çox ehtiyac hiss edən insan növündə, buna bənzər bir halın olmadığını söyləməsi, boş və yalnış görüşlərdən biridir.

**5. Dahilik:**

Platon, dahiliyi, insana uca ilhamları verən İlahi bir hal olaraq tərif etmişdir. Filosoflar, bunu, ağlın heç bir rolunun olmadığı uca bir hal olaraq açıqlamışlardır. Təbiətpərəstlər isə, belə deyirlər:

***“Dahilik, şəxsən təbiətin hədiyyəsidir, oxuyaraq əldə edilməz, düşünmək də, onu meydana gətirməz.”***

Burda dahilik və dahilərə nümunələr veriləcəkdir. Bunlar, vəhy mövzusunda doğru yola yönətlməkdə, son dərəcə aydınladıcı işıq vəzifəsi görəcəkdir.

Cambridge universiteti Psixologiya Fakultəsi doktoru: Miers, “İnsan xarakteri” adını verdiyi geniş həcmli kitabında belə deyir:

***“Mr. Biadlerin demək olar ki, möcüzə qəbul ediləcək bir xüsusiyyəti vardı. Çünki o, heç düşünmədən bir-birinə vurduğu vaxt, 7, ya da 8***

***mərhələli nəticələr verən rəqəmləri müəyyənləşdirə bilirdi. Məsələn, ona:***

***'Bir birilə vurulduğu vaxt, 17.861 nəticəsini verən ədədlər hansılardır?'***

***deyə soruşulduğu vaxt, yerindəcə, 53 və 337 cavabını verirdi. O, özünün bu cavabı necə verdiyini, bilmədiyini söyləyirdi. Onun bu cavab vermə özəlliyi, sanki təbii bir instinkt idi."***

Məşhur fransız şair (Rene) Sully Prodhomme'un belə dediyi nəql edilir:

***"Bir ildən bəridir, bəzi vaxtlarda, gözləmədiyim bir anda, mənə bir mühəndislik nəzəriyyəsinin dəlilinin verilmiş olduğunu görürəm. Təbii ki, bu, mənim heç bir şəkildə meylim olmadan reallaşır."***

O, ümumilikdə, şeirin bir bölməsini tamamlamadan yatdığını, sonra yatınca şeirini tam olaraq tapdığını söyləmişdir.

Fransız şair Alfred de Musset, belə deyir:

***"Mən, heç bir şey etmirəm. Sadəcə qəlbimə buraxılanı dinləyir və nəql edirəm. Sanki məchul bir insan, mənim qulağıma fısıldayır."***

Verdiyimiz bu nümunələr, bəzi fərdlərdə, insanı, adət edilmiş yolun xaricində elm/bilik və hidayət ilə dəstəkləyən batini və ruhi rabitənin varlığını isbat etməkdədir. Bu da insanların, ilahiyyat və nübüvvət mövzularını yalanlamağa və dinlərlə lağlağı etməyə varıncaya qədər şübhələrinin artdığı bir dövrdə, vəhyi insan zehninə olduqca yaxınlaşdırmaqdadır. Halbuki bunlar, insandakı fikri və sosial inkişafın ən böyük faktoru, aləmi dəyişdirən ən böyük hadisə və tarixin axışını çevirən ən böyük olaylardır. Bu böyük hadisələrin, əsli olmayan düşüncələrin, ya da əslə etimad edilməməsi lazım olan yalanların üzərində qurulduğunu

söyləmək, insanı dəyərsizləşdirən ən böyük eyiblərdən biridir.

**6. Müasir elm:**

Müasir elm, elm adamlarının xəyal edə bilmədikləri fövqəl-adi hadisələrdən qəbul edilən bəzi ruhi halları, bəzi insanların ortaya qoyduğuna şahidlik edildiyini açıqlamışdır. Üstəlik, o insanlar, bu fövqəladi hadisələri, fərqində olmadan ortaya qoymuşlardır. Onların etdiklərinin, hislə bağlı maddi bir səbəblə açıqlamağın isə, imkanı yoxdur.

İnsanlar, bunların həqiqət olub-olmadığını sınamış və bu fövqəladi hadisələri görməsi üçün, yer üzündəki ən böyük sehrbazı çağırmış, sonunda insanlar, bunda ən kiçik bir sehrin mövcud olmadığına şahidlik etmişlərdir. Həqiqətən də, bunlar, ruhi hadisələr olub bacarıq və əl surətinin, bunda heç bir rolu yoxdur.

Bax bu, müasir elmin reallıqlarından biridir. Bu hadisə üzərindən, elm adamları, fərqində olmadıqları anlarda, bəzi insanlar üçün fərqli kəşflərin və ruhi reallıqların ortaya çıxacağını açıqlamışlardır.

O halda, necə olur ki, bu elmi kəşflərin yanında, Allahın, yaratdıqları arasından seçdiyi bəzi insanlara vəhy yolu ilə elmi kəşfləri verməsi, uzaq bir ehtimal qəbul edilir?! Üstəlik o insanlar, ağıl və əxlaq sahibi kimsələrdir.

Artıq gözü olanlar üçün, sabah olmuşdur[1]...

---

1 **Muhamməd Əbdü'l-Əzim əz-Zurqani, "Mənəhilu'l-İrfan", 1. Cild, s. 113-123**

# İlham

## 1. Quranda İlham

***«Ona günahları və təqvanı (Allahdan qorxmağı) ilham edənə and olsun ki!»*** **(Şəms/8)**

**Təfsiri:**

***"Sonra da ona... ilham edənə ki..."*** Ona bildirənə ki...deməkdir.

• İbn əbi Nəcih, Mücahiddən belə rəvayət etmişdir.

***Ona, günahkarlıq və təqva yolunu bildirən***, deməkdir.

• İbn Abbas da, belə açıqlamışdır.

• Yenə Mücahiddən:

***"...ona, itaət və masiyyəti (günahı) bildirən..."*** deyə açıqlandığı nəql edilmişdir.

• Muhamməd b. Ka'b'dan belə dediyi rəvayət edilir:

***"Şanı uca olan Allah, qulu haqqında xeyir murad etdiyi təqdirdə, ona xeyir işləməyi ilham edər, o da, xeyir işləyər. Onun haqqında pislik murad etdiyi təqdirdə, ona şərri ilham edər, o da, şər işləyər."***

• əl-Fərra deyir:

***"Ona...ilham edən..."*** Ona xeyir və şər yolunu bildirib tanıdan, deməkdir. Necə ki, uca Allah:

***"Onu iki yoxuşlu yola yönəltmədikmi."*** **(Bələd/10)** deyə buyurmuşdur.

• əd-Dahhaq'ın rəvayətinə görə, ibn Abbas belə demişdir:

"Təqva sahibi möminə- təqvasını; günahkar olan kimsəyə də günahkarlığını ilham etmişdir."

• Səiddən gələn rəvayətə görə, o, Qatadənin belə dediyini rəvayət etmişdir:

"O, hər bir nəfsə, özü üçün günah olanı da, təqvalı olanı da açıqlamışdır."

Mənalar bir birinə yaxındır. Əbu Hureyrədən belə dediyi rəvayət edilmişdir:

Allah rəsulu (sallallahu aleyhi və səlləm):

***"(Sonra da) ona günahları və təqvanı (Allahdan qorxmağı) ilham edənə ki..."***

buyuruğunu oxuduqdan sonra, belə buyurdu:

***"Allahım, Sən mənim nəfsimə təqvasını ehsan buyur və onu tərtəmiz qıl. Sən onu tərtəmiz qılanların ən xeyirlisisən. Sən onun vəlisi və məvlasısan."***(1)

---

1 **Qurtubi, "əl-Cami li Ahkami'l-Quran" təfsiri, Şəms/8**

***«Ona (nəfsə), günahları və Allahdan qorxmağı ilham edənə and olsun ki...»* (Şəms/8)**

**Təfsiri:**

Ayət, mücməl olaraq, bu 2 şəkildə təfsir edilə bilər:

***Nəfsə, fücur (yəni günahının) və təqvasının ilham edilməsi***, ona:

• bunların bildirilməsi;

• bunların düşündürülməsi;

• birinin gözəl, digərinin çirkin olduğunun bildirilməsi; və nəfsə:

• bunlardan istədiyini seçməsi imkanının verilməsi

deməkdir. Bu məna ilə, ayət, eynilə:

***«Onu iki yoxuşlu yola yönəltmədikmi?»* (Bələd/10)** ayəti kimi olmuş olur. Bu, Mötəzilə məzhəbinə uyğun olan bir təvil və təfsirdir. Çünki onlar, belə deyirlər:

“Bunun belə olmasının dəlili, Haqq Taala, bu ayətin ardından:

***“Nəfsini günahdan təmizləyən uğur qazanmışdır. Onu günaha batıran isə, ziyana uğramışdır.”* (Şəms/9-10)** buyurmasıdır. Bu izah, həm ibn Abbas (radiyallahu anh), həm də bir qrup iləri gələn müfəssirlərdən nəql edilmişdir.

Bu, ***“Allah Taala:***

• ***mömin və müttəqi olana təqvanı;***

• ***kafirə də fücuru (günahı, pisliyi) ilham etmişdir***.” deməkdir.

• Səid b. Cubeyr:

***“O nəfsi, fücuru və təqvası ilə baş başa buraxan...”*** mənasını vermişdir.

• İbn Zeyd:

***“O nəfsdə, onu təqvaya müvəffəq qılması ilə, bu məhrumiyyəti meydana gətirdi.”*** deyə izah etmişdir.

Zəccac və Vahidi də, bunu tərcih etmişlərdir.

## İlham nədir?

Vahidi belə deyir:

Öyrətmək, anlatmaq və açıqlamaq başqa şeydir; ilham isə, daha başqa bir şeydir. Çünki ilham, Allah Taalanın, qulunun qəlbinə bir şeyi salması, qoyması deməkdir. Allah Taala, qulunun qəlbinə (və ya ağlına) bir şey saldığında isə, onu, ondan ayrılmaz hala gətirir. Çünki ilhamın əsas mənası, ərəblərin, -biri bir şeyi bir dəfə udduğunda- istifadə etdikləri:

***‘Ləhimə’ş-şəy’u, iltəhaməhu’*** şəklindəki sözlərinə dayanır.

Yenə ərəbcədə:

***‘O şey, onu uddu.’ mənasında: ‘əlhəmətəhu zəlikə’ş-şəy’u’*** ifadəsi istifadə edilir.

Bax bu ‘ilham’ kəliməsinin, əsas mənası, budur.

Ancaq daha sonra bu ifadə, eynilə bir ‘uddurmaq’ kimi olduğu üçün, Allah Taalanın, qulunun qəlbinə saldığı şeyləri ifadə etmək üçün istifadə edilmişdir. O halda, bu deməkdir ki, bu əsas mənaya ən uyğun təfsir, ibn Zeyd’inkidir. Çünki bu görüş, Allah Taalanın, möminə təqvasını; kafirə də günahını yaratdığı xüsusunda, açıq bir izahdır. Mötəzilənin, Haqq Taalanın bu ayətdən sonra:

***'Nəfsini günahdan təmizləyən uğur qazanmışdır.'* (Şəms/9)** ayətini buna dəlil gətirməsinə gəlincə, bu, zəifdir. Çünki, Səid b. Cubeyr, Ata, İkrimə, Muqatil və Kəlbi›dən rəvayət edildiyinə görə, məna:

***"Allah Taalanın tərtəmiz qılıb islah etdiyi nəfslər, mütləq qurtulmuş və xoşbəxt olmuşlardır."*** şəklində olur ki, bunlar, Allah Taalanın, Özünə itaətə müvəffəq qıldığı nəfslərdir.» deməkdir.

Vahidi'nin izahı burda sonlanır. Bu, gözəl və tam bir izahdır.

Mən (Razi) isə, deyirəm ki:

Bir az əvvəl, bu 3 ayətin, Haqq Taalanın, -ülvi (uca), süfli (alçaq, aşağı), bəsit və mürəkkəb varlıqların,- idarə edicisi olduğuna dəlalət etmək üçün zikr edildiyini söyləmişdik. Burda geriyə, maddə aləmində yer alan varlıqlardan hər şeyin, -bu diqqət çəkməyin gərəyi olaraq-, Haqq Taalanın yaratması və tədbiri ilə olduğunu bildirmək qalır. Bundan da, qəlblərdə (və ya ağıllarda), bütün bunların, Allahın qəza və qədərilə olub-olmadığı xüsusu yenidən ortaya çıxır. "Bunlar" dediyimiz şeylər, canlıların ixtiyari felləridir. Bundan dolayı, Haqq Taala:

***"Sonra da ona, həm günahını, həm də təqvasını ilham edən..."*** buyurmaq surətilə, bu şeylərin də, Allahdan, Allah ilə və Allahın qəza və qədərilə olduğuna diqqət çəkmişdir. Bu halda isə, Allah Taala xaricində qalan şeylərin, Onun qəza və qədərilə meydana gəldikləri; Onun icad və təsərrüfünün altında olduqları sabit olur.

Digər yandan, Haqq Taalanın:

***"O nəfsə, həm günahını, həm təqvasını ilham edən..."*** ifadəsindən, bu İlahi yardımın qəsd edildiyinə dair, əqli dəlil, dəfələrlə bəhs etdiyimiz bu xüsusdur:

İxtiyari fellər, ixtiyar və iradənin mövcudluğuna dayanır. Bundan

dolayı, bu fellərin meydana gəlməsi:

• Əgər bir fail (fel sahibi) olmadan olursa, bu deməkdir ki, muhdəs (sonradan olan) varlıq, faildən müstağni olmuşdur, failə ehtiyac duymaz.

• Yox əgər:

***“Bu ixtiyari fellər, bir faildən meydana gəlmişdir. Bu fail də, quldur***.” deyilərsə, o vaxt, təsəlsül[1] lazımdır.

• Yox əgər:

***“Bu fellər, Allahdan meydana gəlmişdir.”*** deyilərsə, bax çatmaq istədiyimiz nəticə budur və doğrudur. Həm sonra insan, özünə bir nəzər salsın. Çünki çox dəfə heç xəbəri yox ikən, o şey heç ağlında yox ikən, birdən qəlbinə onun şəkli, planı, surəti doğur. Qəlbə doğan bu şəkldən dolayı, qəlbdə o şeyə bir meyil meydana gəlir. Üzvlərin (orqanların) hərəkətləri və bu şeyin fel olaraq meydana gəlməsi də, qəlbdəki bu meylə dayanır. Bax bu Haqq Taalanın:

***“...ilham edən...”*** ayətindən qəsd edilən mənanın, Mötəzilənin iləri sürdüyü deyil, bizim iləri sürdüyümüz şey olduğunu, qətiyyətlə ifadə edər.[2]

---

1 **Təsəlsül**: zəncirləmə, deməkdir. Yəni, iddia ilə dəlilin, bir birinə bağlı olması ilə, ixtilafın zəncirləmə davam etməsidir. İmamın burda qəsd etdiyi, fellərin yaradıcısı olaraq qul nəzərə alınarsa, bunun, ta ki, ilk insana qədər davam etməsi lazımdır. Yəni birindən meydana gələn bir fel, başqa birinin təsirilə meydana gəlmiş, ona da başqa biri səbəb olmuş və hakəza (beləcə) ilk insana qədər bunun davam edib getməsi lazımdır.

2 **Fəxrəddin ər-Razi, "Məfatihu'l-Ğeyb" təfsiri, Şəms/8 təfsiri**

***“Biz Musanın anasına: “Onu əmizdir. Ondan ötrü qorxduqda isə onu çaya at. Qorxma və kədərlənmə. Çünki Biz onu sənə qaytaracaq və onu elçilərdən edəcəyik”– deyə VƏHY etdik.”*** **(Qasas/7)**

**Təfsiri:**

***«Musanın anasına: «Onu əmizdir...» deyə VƏHY etdik***.» buyuruğunda keçən «vəhy»in mənasına və nə şəkildə izah ediləcəyinə dair açıqlamalar:

• Al-i İmran/44;

• Məryəm/11;

• Taha/38

ayətlərinin təfsirlərində keçməkdədir.

Musanın anasına edilən bu vəhyin mahiyyəti haqqında, görüş ayrılıqları vardır:

• Bir qrup: ***“Bu, yuxuda ona söylənmiş bir sözdür.”*** deyərkən;

• Qatadə: ***“Bu, bir ilham idi.”*** demişdir.

• Bir başqa qrup: ***“Bu, özünə görünən bir mələk vasitəsilə olmuşdu.”***

Muqatil belə deyir:

***“Cəbrail bu xüsusu ona bildirmişdi.”***

Buna görə, bu, ilham deyil, bildirmək surətində bir vəhydir. Bununla birlikdə, hər kəs, Musanın anasının peyğəmbər olmadığını, icma ilə qəbul etmişdir. Ona mələyin göndərilməsi isə, Buxari və Muslim tərəfindən rəvayət edilən, məşhur hədisdə, keçəl, cüzzam xəstəliyinə

tutulmuş kimsə və korla danışması **(Buxari, Ənbiya:51**) qəbilindəndir.

Bunun xaricində, ayrıca, peyğəmbərlik bəhs mövzusu olmadan, mələklərin insanlarla danışdıqlarına dair gələn başqa rəvayətlər də, bu qəbildəndir.

Mələklər, İmran b. Husayn'a salam vermişdilər. Lakin o, bununla, peyğəmbər olmamışdı[1].

1 **(Qurtubi, "əl-Cami li Ahkami'l-Quran" təfsiri, Qasas/7**

***“O vaxt ki, anana vəhy olunacaq şeyi belə vəhy etdik...”* (Taha/38)**

**Təfsiri:**

Burdakı ***“vəhy etmişdik***...” buyruğunun, ***“ilham vermişdik...”*** mənasında olduğu söylənmişdir. Deyildiyinə görə, ona yuxuda ikən vəhy etmişdi. İbn Abbas da:

***“Peyğəmbərlərə vəhy etdiyi kimi, ona (Musanın anasına) da vəhy etmişdi.”*** demişdir[1].

---

1 **Qurtubi, “əl-Cami li Ahkami’l-Quran”, Taha/38 təfsiri**

***“Bunlar qeyb xəbərlərindəndir ki, onu sənə vəhy edirik. Hansının Məryəmi himayə edəcəyi barədə qələmlərini püşk atdıqları zaman sən onların yanında deyildin. Bir-birilərilə mübahisə etdikdə də sən onların yanında deyildin.”*** **(Al-i İmran/44)**

**Təfsiri:**

Uca Allahın: ***“Bunlar, Sənə vəhy etməkdə olduğumuz qeyb xəbərlərindəndir.”***

buyuruğundan məqsəd, budur:

***“Yəni Zəkəriyyə, Yəhya və Məryəm’in (Allahın salamı olsun hər birinə), hallarına dair sözünü etdiyimiz bu xüsuslar, qeybə dair xəbərlərdəndir.”***

***“...Sənə vəhy etməkdə olduğumuz...”*** buyuruğunda da, Muhamməd (sallallahu aleyhi və səlləm)’in peyğəmbərliyinə, açıq bir dəlil vardır. Çünki Allah rəsulu (sallallahu aleyhi və səlləm), keçmişlərin kitablarını oxumadığı halda, Zəkəriyyə ilə Məryəmin qissələrinə dair xəbərlər vermiş və bu mövzuda, kitab əhli də Onu təsdiq etmişlərdi.

Burda: ***“vəhy etmək”***dən məqsəd isə: Peyğəmbər (sallallahu aleyhi və səlləm)’ə risalət vermək deməkdir. Vəhy isə, ilham ilə də ola bilər, işarətlə də, başqa şəkillərdə də ola bilər. Lüğətdə bunun əsl mənası: ***“bir şeyi gözəlcə bildirmək”*** deməkdir. Bax bundan dolayı, ilham da, vəhy deyə adlandırılmışdır. Uca Allahın bu buyuruğu, bu qəbildəndir:

• ***“Bir zaman Mən həvarilərə: “Mənə və elçimə iman gətirin!”– deyə vəhy etmişdim...”*** **(Maidə/111);**

• ***“Rəbbin bal arısına belə vəhy etdi: “Dağlarda, ağaclarda və***

***insanların düzəltdikləri çardaqlarda özünə pətəklər hör.”* (Nəhl/68)**

***“Həvarilərə vəhy etmişdim...”*** buyuruğunun: ***“onlara əmr etdim.”*** mənasında olduğu da söylənmişdir.

İbn Faris belə deyir:

***“Vəhy: işarət, yazmaq və xəbər göndərmək (risalət) deməkdir. Səndən başqasına, bilmək üzərə buraxdığın hər şeyə (vəhy) deyilir. Vəhy, eyni zamanda: “sürətli” deməkdir. Səsə də, “əl-vaha” deyilir.”***[1]

1 **(Qurtubi, “əl-Cami li Ahkami’l-Quran”, Al-i İmran/44 təfsiri**

***“Bunlar qeyb xəbərlərindəndir ki, onu sənə vəhy edirik. Hansının Məryəmi himayə edəcəyi barədə qələmlərini püşk atdıqları zaman sən onların yanında deyildin. Bir-birilərilə mübahisə etdikdə də, sən onların yanında deyildin.”*** **(Al-i İmran/44)**

**Təfsiri:**

Ayətdə keçən “qeyb xəbərləri”ndən məqsəd:

Allah rəsulu (sallallahu aleyhi və səlləm)’in qövmünün və bir çox insanların bilmədiyi, Allah Taalanın bildirməsiylə ancaq 2 əhl-i kitabın haham və ruhanilərinin bilə biləcəkləri xəbərlərdir. Allah Taala, bu kimi xəbərləri Muhamməd (sallallahu aleyhi və səlləm)’ə bildirərək, Onun haqq peyğəmbər olduğunu inkar edən yəhudi və xristiyanlara, Allah rəsulunun doğruluğunu isbatlamış, Onu yalanlayanları isə, susdurmuşdur. Çünki onlar, Allah rəsulu (sallallahu aleyhi və səlləm)’in oxuma-yazması olmayan bir şəxs olduğunu, Allahın, özünə bu xəbərləri bildirməməsi halında, Onun, bunları bilə bilməyəcəyini bilirlərdi. Beləcə, qarşı çıxmaqdan aciz qalmışlardı.

Ayətdə zikr edilən: ***“Sənə vəhy etdiyimiz...”*** ifadəsindən məqsəd:

***“Sənə endirdiyimiz və Sənə göndərdiyimiz”*** deməkdir.

Vəhy etməyin əsl mənası, vəhy edənin bildirmək istədiyi şeyi, vəhy edilənə çatdırmasıdır. Bu çatdırma işi, fərqli vasitələrlə olur:

• ***Yazı ilə*** ola bilər.

• ***İşarətlə*** ola bilər. Necə ki, bu ayətdəki vəhy etməkdən məqsəd, işarətdir:

***“O (Zəkəriyyə), mehrabdan öz qövmünün qarşısına çıxıb onlara***

***vəhy (işarə) etdi: “Səhər-axşam Allaha təriflər deyin!”*** **(Məryəm/11)**

• ***İlhamla*** ola bilər. Bax bu ayətlərdəki vəhy etməkdən məqsəd də, ilhamdır:

***“Rəbbin bal arısına belə vəhy (ilham) etdi: “Dağlarda, ağaclarda və insanların düzəltdikləri çardaqlarda özünə pətəklər hör.”*** **(Nəhl/68)**

***Elçi göndərmək surətilə*** ola bilər. Bu ayətdəki vəhy etməkdən məqsəd də, budur:

***“De: “Kimin şahidliyi daha böyükdür?” De: “Allah mənimlə sizin aranızda Şahiddir. Bu Quran mənə vəhy olundu ki, onunla sizi və onun çatacağı hər kəsi xəbərdar edim. Məgər siz Allahla yanaşı ibadətə layiq olan başqa məbudların olduğuna şahidlik edirsiniz?” De: “Mən şahidlik etmirəm!” De: “O, Tək olan İlahdır. Mən sizin şərik qoşduqlarınızdan uzağam”*** **(Ənam/19)**

Vəhy etmək, bəzən də, ***şeytanın vəsvəsə verməsi*** mənasına gəlir. Bu ayətdəki vəhy etməkdən məqsəd də budur:

***“Üstündə Allahın adı çəkilməmiş – “bismilləh” deyilib kəsilməmiş heyvanlardan yeməyin. Çünki bu, günahdır. Həqiqətən, şeytanlar öz dostlarına sizinlə mübahisə etmək üçün vəhy edirlər (vəsvəsə verirlər). Əgər onlara itaət etsəniz, sözsüz ki, siz də müşriklərdən olarsınız.”*** **(Ənam 121)**[1]

---

1 **(Fəxrəddin ər-Razi, "Məfatihu'l-Ğeyb" təfsiri, Al-i İmran/44 təfsiri)**

***Biz Musanın anasına: "Onu əmizdir. Ondan ötrü qorxduqda isə onu çaya at. Qorxma və kədərlənmə. Çünki Biz onu sənə qaytaracaq və onu elçilərdən edəcəyik"– deyə VƏHY etdik.*** **(Qasas/7)**

***Allah buyurdu: "Dilədiyin sənə verildi, ey Musa! Sənə bir dəfə də mərhəmət göstərmişdik. O vaxt ki, anana VƏHY olunacaq şeyi belə VƏHY etdik:***

***"Onu bir sandığa qoyub çaya burax ki, çay onu sahilə atsın və həm Mənim düşmənim, həm də onun düşməni olan birisi onu götürsün".***

***Gözlərim önündə boya-başa çatdırılasan deyə, Öz tərəfimdən sənə qarşı qullarım arasında məhəbbət oyatdım.*** **(Taha/36-39)**

**Təfsiri:**

**Qadın peyğəmbər vardırmı?**

Alimlərin əksəriyyəti, Musa (əleyhissəlam)'ın anasının, nəbi və peyğəmbər olmadığı xüsusunda, ittifaq etmişlərdir. Bundan dolayı, bu ayətdən anlaşılan "vəhy" ilə, peyğəmbərlərə gələn o vəhy, necə murad edilmiş ola bilər?!

Həm qadın:

• hökm verməyə (hakim olmağa);

• imam (və dövlət başçısı) olmağa;

• hətta imam Şafi (radiyallahu anh)'a görə, öz-özünü evləndirməyə belə

səlahiyyətli olmadığı halda, biz bunu (yəni peyğəmbər olmağını) necə söyləyə bilərik?!

Bundan dolayı, qadın, peyğəmbər ola bilməz. Buna, Haqq Taalanın:

***«Biz səndən əvvəl də, özlərinə vəhy nazil etdiyimiz ancaq kişilər göndərmişdik. Əgər bilmirsinizsə, Zikr əhlindən soruşun.»*** **(Ənbiya/7)** ayəti dəlalət edir. Bu ayət, mövzu haqqında, çox açıq bir ifadədir. Həm sonra da, Quranda, «vəhy» kəliməsi, həmişə «peyğəmbərlik» mənası da ifadə etmir. Necə ki, Haqq Taala, Nəhl/68'də:

***«Rəbbin bal arısına belə vəhy etdi: "Dağlarda, ağaclarda və insanların düzəltdikləri çardaqlarda özünə pətəklər hör.»*** buyurmuşdur.

Yenə Allah Taala:

***«Bir zaman Mən həvarilərə: "Mənə və elçimə iman gətirin!"– deyə vəhy etmişdim. Onlar da: "İman gətirdik. Sən də şahid ol ki, biz müsəlmanlarıq!"– demişdilər."*** **(Maidə/111)** buyurmuşdur.

**Vəhyin bu ayətdə mənası:**

Alimlər, bu ayətdə keçən vəhy ilə nə murad edildiyi xüsusunda, bu fərqli izahları vermişlərdir:

Bununla, Musa (əleyhissəlam)'ın anasının gördüyü bir yuxu qəsd edilmişdir. Bu yuxunun izahı, Musa (əleyhissəlam)'ın tabuta qoyulub, dənizə (Nilə) buraxılması və Allah Taalanın onu təkrar anasına qovuşdurması şəklində idi.

Bununla, Musa (əleyhissəlam)'ın anasının qəlbinə, bir anda düşən qəti bir qərar qəsd edilmişdir. Bundan dolayı, içinə düşdüyü bir hal xüsusunda düşünən hər kəs üçün, o şeydən qurtulmağa ən uyğun fikir ortaya çıxar. Bax ağla gələn o fikrə də "vəhy" deyilir.

Bununla, **"İLHAM"** qəsd edilmişdir. Lakin ilhamdan bəhs

etdiyimizdə, bununla, «ağla gələn, qəlbə qalib olan şey» mənasını qəsd edirik. Bundan dolayı, bu da, eynilə ikinci izah kimi olur.

Bu 3 izaha, bu şəkillərdə etiraz edilmişdir:

***«Dənizə atmaq da, onu həlak etmək (öldürmək) kimi bir şeydir. Bundan dolayı, bu hal, Firondan görülməyə ülfət edilmiş olan o öldürmə işinin qorxusuna bərabər bir qorxudur. Dolayısı ilə, bunların ikincisindən qorunmaq (yəni Musanı ölümdən qurtarmaq) üçün, birincisini etmək (yəni Musanı dənizə atmaq) necə caiz ola bilər?»***

Buna, bu şəkildə cavab veririk:

Bəlkə də, Musa (əleyhissəlam)'ın anası, araşdırma nəticəsində, yuxusunun doğruluğunu başa düşmüşdü. Beləcə, uşağının Fironun əlinə düşməsindənsə, dənizə atmasının, qurtulmasına nisbətən imkan verəcəyini, zənn-i qaliblə (qalib olan zənnilə) başa düşmüş olur.

Bəlkə də, bu xüsus, o vaxt mövcud olan, Şuayb (əleyhissəlam) və bənzəri bir peyğəmbərə vəhy edilmişdi. Daha sonra, o peyğəmbər, bunu, Musa (əleyhissəlam)›ın anasına, ya sözlü olaraq (şəxsən), ya xəbər göndərərək bildirmişdir.

Buna da, bu şəkildə etiraz edilmişdir:

***"Əgər hal belə olsaydı, Musa (əleyhissəlam)'ın anasının içinə düşdüyü o fərqli-fərqli qorxular, ona gəlməzdi?!"***

Bu etiraza da, belə cavab verilə bilər:

Belə bir qorxu, insanlıq gərəyidir. Necə ki, Musa (əleyhissəlam) da, özünə, şəxsən Allah Taala, firona getməsini əmr etməsinə rəğmən, firondan qorxmuşdu.

Bəlkə də, İbrahim, İshaq, Yaqub (əleyhimussəlam) kimi, daha əvvəlki peyğəmbərlər, bunun belə olacağını, xəbər vermişlərdi. Bu xəbər də, o qadına çatmışdı.

Bəlkə də, Haqq Taala, eynilə Məryəmə:

***"...Biz Öz Ruhumuzu (Cəbraili) onun yanına göndərdik. O, Məryəmin qarşısında kamil bir insan surətində peyda oldu."* (Məryəm/17)** ayətində bildirildiyi kimi, Cəbraili göndərməsi şəklində, peyğəmbərlik bəhs mövzusu olmadan, Musa (əleyhissəlam)'ın anasına da, bir mələk göndərmişdir. Ayətdəki:

***"...anana vəhy edilməsi gərəkli olan şeyi vəhy etdik..." deməkdir*.** Bunun vəhy edilməsi, gərəkli olmuşdur. Çünki hadisə, çox böyük və əhəmiyyətlidir. Bu xüsusda doğru və faydalı olanı bilmək, ancaq vəhy ilə mümkündür. Bundan dolayı vəhy, gərəklidir.[1]

1 **Fəxrəddin ər-Razi, "Məfatihu'l-Ğeyb" təfsiri, Taha/36-39 təfsiri**

***“Bir zaman Mən həvarilərə: “Mənə və elçimə iman gətirin!”– deyə VƏHY etmişdim. Onlar da: “İman gətirdik. Sən də şahid ol ki, biz müsəlmanlarıq!”– demişdilər.”*** **(Maidə/111)**

**Təfsiri:**

Vəhyin nə mənaya gəldiyi, daha əvvəl açıqlanmışdı. Bundan dolayı, ayətdə bəhs edilən:

• “havarilər”in peyğəmbər olduğunu söyləyənlər, bunun peyğəmbərlərə edilən növdən bir vəhy olduğunu;

• onların peyğəmbər olmadıqlarını söyləyənlər isə, bunun, “ilham və qəlbə buraxılan, qoyulan şey” mənasında olduğunu söyləmişlərdir.

Bu, eynilə,

• ***“Musanın anasına: Onu əmizdir.’ deyə VƏHY etdik***.” **(Qasas/7);** və

• ***“Rəbbin bal arısına vəhy etdi ki...”*** **(Nəhl/68)** ayətlərində keçən “vəhy” kimidir.

Allah Taala, bu xüsusu, (havarilərə edilən ehsanları) nemətləri saymaq sədədində gətirmişdir. Çünki insanın, digər insanlar nəzdində sözünün qəbul edilməsi və qəlblərində sevgi qazanması, Allahın insana ən böyük nemətlərindən biridir.

Allah Taala, bunu, havarilərin qəlbinə ilham etdiyində, onların iman edib müsəlman olduqlarını bildirmişdir.

Bu ayətdə, “iman”ı, “İslam”dan əvvəl zikr etmişdir. Çünki iman, qəlbə aid bir vəsfdir; İslam isə, zahirən boyun əyib itaət etməkdən ibarətdir. Yəni:

***"Onlar həm qəlblərilə iman etdilər; həm də zahirən boyun əydilər.***" deməkdir[1].

1 **Fəxrəddin ər-Razi, "Məfatihu'l-Ğeyb" təfsiri, Maidə/111**

***“Bir zaman Mən həvarilərə: “Mənə və elçimə iman gətirin!”– deyə vəhy etmişdim. Onlar da: “İman gətirdik. Sən də şahid ol ki, biz müsəlmanlarıq!”– demişdilər”.*** **(Maidə/111)**

**Təfsiri:**

Vəhy, ərəbcə, ilham deməkdir. O, bir neçə qismə ayrılır:

• Cəbrailin peyğəmbərlərə göndərilməsi mənasında bir vəhy;

• Bu ayətdə olduğu kimi ilham mənasında vəhy. Yəni:

***“Mən, onlara ilham etmiş və qəlblərinə belə bir məna buraxmışdım.”*** deməkdir. Necə ki, uca olan Allahın:

***“Rəbbin bal arısına vəhy (ilham) etdi*.”** **(Nəhl/68);** və

***“Musanın anasına vəhy (ilham) etdik*.”** **(Qasas/7)** buyruqları, bu qəbildəndir.

• Yuxuda və oyaq ikən bildirmək mənasına da gəlir.

• əbu Ubeydə belə deyir:

***“Vəhy etdim, əmr etdim mənasına gəlir.”***[1]

1 **Qurtubi, “əl-Cami li Ahkami’l-Quran”, Maidə/111 təfsiri**

***“Rəbbin bal arısına belə VƏHY etdi:***

***‘Dağlarda, ağaclarda və insanların düzəltdikləri çardaqlarda* özünə pətəklər hör.” (Nəhl/68)**

**Təfsiri:**

Bu ayətə dair açıqlamalarımızı, 3 başlıq halında təqdim edəcəyik:

Allahın, arıya vəhy etməsi (ilhamı):

***“...Rəbbin bal arısına belə VƏHY etdi***...” ayətində bəhsi keçən vəhylə bağlı açıqlamalar, daha əvvəl keçmiş olmaqdadır. Vəhyin, ilham mənasına gəldiyini də, orda bildirmişdik[1].

**İlham:**

Şanı uca olan Allahın, zahiri hər hansı bir səbəb olmadan, qəlbdə yaratdığı bir şeydir. Bu da, uca Allahın:

***«Ona (nəfsə) günahları və təqvanı (Allahdan qorxmağı) ilham edənə (and olsun)!»* (Şəms/8)** ayəti qəbilindəndir. Heyvanlar da, bunlar arasındadır.

Şanı uca olan Allah, heyvanlarda:

• öz mənfəətlərini idrak etmələri;

• zərərlərdən çəkinib həyatlarını idarə etmələri

ilə bağlı yaratdıqları ilhamlar, bu qəbildəndirlər. Uca olan Allah, cansız varlıqlar haqqında da, bu növdən xəbər verdiyi bir ayətində:

***«Həmin gün yer öz əhvalatlarını danışacaqdır. Çünki Rəbbin ona***

---

1 **Al-i İmran/44-cü ayət, 1. başlıq**

***VƏHY edəcəkdir.»*** **(Zilzal/4-5)** deyə buyurmaqdadır.

• Belə deyilmişdir:

Əziz və Cəlil olan Allahın, cansız varlıqlarda, mahiyyəti idrak olunmayan bir qüdrəti vardır. Bu cansız varlıqlara, Allahdan bir rəsul gəlmədiyi halda, uca Allah, bu varlıqlara (bu qüdrəti) bildirmişdir. Yəni, ilham etmişdir. Təvil alimləri arasında, burda bəhsi keçən vəhyin, ilham mənasında olduğu mövzusunda, görüş ayrılığı yoxdur.

Arıya verilən ilhamın mahiyyəti:

***«...dağlarda, ağaclarda...»*** ayəti, arının sahibləri olmaması halı ilə bağlıdır.

***«...və insanların düzəltdikləri çardaqlarda özünə pətəklər hör...»***

Bax Allah Taala, arıların məskənlərini, bu 3 yerdə təsbit etmişdir:

• ya dağlarda;

• ya ağaclarda;

• ya da Adəm oğullarının düzəltdikləri çardaqlarda.

Arıların heyrət verici özəlliklərindən:

İbnu›l-Arabi deyir:

***“Uca Allahın, arıda yaratdığı heyrət verici özəlliklərindən biri də, ona, pətəklərini 6 bucaqlı olaraq qurmasını ilham etməsidir. Beləliklə, arı pətəyi, tək bir parça imiş kimi, bir-birinə bitişmiş olmaqdadır. Çünki 3 bucaqdan 10 bucağa qədər bütün şəkillərin hər biri, öz bənzərlərilə yan yana gətiriləcək olarsa, bunlar, bitişik olmaz və mütləq, aralarında bəzi açıqlıqlar olar. Bundan tək istisna is***ə, 6 ***bucaqd***ı***r. Alt***ı ***bucaq, bənzərlərilə bir araya gətiriləcək olarsa, tək***

***parça imiş kimi, bir-birinə bitişik bir hal alar.”***[1]

1 **Qurtubi, “əl-Cami li Ahkami’l-Quran”, Nəhl/68 təfsiri**

***Rəbbin bal arısına belə vəhy etdi:***

***“Dağlarda, ağaclarda və insanların düzəltdikləri çardaqlarda özünə pətəklər hör. Sonra bütün meyvələrdən ye və Rəbbinin səndən ötrü asanlaşdırdığı yollarla get”. O arıların qarınlarından tərkibində insanlar üçün şəfa olan müxtəlif rəngli bal çıxır. Həqiqətən, bunda düşünən adamlar üçün dəlillər vardır.”*** **(Nəhl/68-69)**

**Təfsiri:**

Ustad Said Nursi (rahiməhullah), “Şualar” adlı əsərində, ayəti belə təfsir edir:

*“...Evet, balarısı, fitratça ve vazifece öyle bir mu’cize-i kudrettir (qüdrət möcüzəsidir) ki, koca Sûre-i Nahl (böyük Nəhl surəsi), onun ismiyle tesmiye edilmiş (adı ilə adlandırılmışdır). Çünkü:*

• *O küçücük bal makinesinin zerrecik başında onun ehemmiyetli vazifesinin mükemmel programını yazmak; ve*

• *Küçücük karnında, taamların en tatlısını (balı) koymak ve pişirmek; ve*

• *Süngücüğünde, zîhayat âzâları (canlı orqanları) tahrip etmek ve öldürmek hâsiyetinde bulunan zehiri, o uzuvcuğuna ve cismine zarar vermeden yerleştirmek,*

*nihayet dikkat ve ilimle ve gayet hikmet ve irade ile ve tam bir intizam ve muvazene ile olduğundan, şuursuz, intizamsız, mizansız olan tabiat ve tesadüf gibi şeyler, elbette müdahale edemezler ve karışamazlar.*

*İşte, bu üç cihetle mu›cizeli bu san›at-ı İlâhiyenin (İlahi sənətin) ve bu fiil-i Rabbâniyenin (Rabbani fellərin) bütün zemin yüzünde (yer*

*kürəsində), hadsiz arılarda, aynı hikmetle, aynı dikkatle, aynı mizanda, aynı anda, aynı tarzda zuhuru ve ihâtası, bedahetle (açıq bir şəkildə) vahdeti ispat eder...»*

Ustad Nursi (rahmətullahi aleyh), ayətin möcüzə yönünü, arının xilqətindəki sənət yönündən ələ almaqdadır. Arının yaradılışındakı 3 fərqli sənət, birlikdə meydana çıxmaqdadır:

1. Başında (beynində) həyat proqramının kodlanmış olması;

2. Qarnında yeməklərin ən dadlısının (balın) bişirilməsi;

3. İynəsində isə, öldürücü zəhərin yerləşdirilməsi.

***"O küçücük bal makinesinin zerrecik başında onun ehemmiyetli vazifesinin mükemmel programını yazmak..."***

Arının:

• şüurlu, hikmətə uyğun, son dərəcə qüsursuz şəkildə, yuvasından kilometrlərlə uzaqlaşıb təkrar yuvasına dönməsi;

• digər arılarla "arı rəqsi" şəklində münasibət qurması;

• günəşin mövqeyi dəyişsə də, yuvalarını və su qaynaqlarının yerlərini tapa bilmələri;

• digər zərərli həşəratlara qarşı, təşkilatlı bir şəkildə qarşı durmaqları;

• yuvanın qapısını bağlayıb sürətli bir şəkildə qanad çırparaq yuvaya girən zərərli eşşək arılarını, hərarətlərini artıraraq öldürmələri

kimi qeyr-i adi fellər sərgiləmələri onu göstərir ki, arılar, mütləq bir elm və hikmətin, sövq və idarəsi altındadırlar.

***«Küçücük karnında, taamların en tatlısını koymak ve pişirmek...»***

Arılar, topladıqları çiçəyin nektarlarını yeməkdədirlər. Bu nektarlar, onların mədələrində həzm edilir və bir «mətbəx» kimi dünyanın ən şirin və zövq verici qidası, arının qarnında hazırlanır. Sonra arı, bu hazırladığı balı qusaraq, 6 bucaqlı pətəklərə doldurur.

Mədə, həzm mərkəzidir. Aldığı qidaları həzm edir, bağırsaqlara ötürür, o da, vücuda ehtiyac olan qisimləri aldıqdan sonra, digərlərini ifraz kanalı ilə xaricə atır.

Arıda isə, mədə, «mətbəx» funksiyası görür. Arı, bitkilərin fotosintez edərək qidaları istehsal etmələri kimi, o da çiçək nektarlarını toplayıb su ilə birləşdirərək, qarnında bişirir və şəfalı bal istehsal edir.

Bal, mədədə hazırlandığı və orqanizmin qida ehtiyaclarını qarşılayacaq bir quruluşa sahib olduğu halda, mədə həzm vəzifəsinə keçib balı həzm etmir. Bal hazır olduğunda, arı, balı ağzından xaricə axıdır. Burda, qeyr-i adi bir hal vardır. Belə ki:

Qidaların ən ləzzətlisi arının mədəsində hazırlandığı, arı da ləzzət dərəcəsində bala məftun olduğu halda, balı qusaraq pətəklərə doldurması və həzm etməməsi, arının xilqəti nöqtəsində, möcüzə bir keyfiyyətdir.

***«Süngücüğünde, zîhayat âzâları (canlı orqanları) tahrip etmek ve öldürmek hâsiyetinde bulunan zehiri, o uzuvcuğuna ve cismine zarar vermeden yerleştirmek...»***

Arının zəhəri, digər arılar üçün öldürücü və canlıların cisimlərini zədələyəcək bir tərkibə sahib olduğu halda, o zəhərin, arının cismi içərsində ona zərər vermədən yerləşdirmək və arının içində hazır bir silaha çevirmək, fövqə'l-adi bir feldir. Bənzər bir hal, ilan zəhərinin, dişləri arasından axıb başqa canlıları öldürdüyü halda, özünü zəhərləməyəcək şəkildə, ilanın orqanizmində depolanmasıdır.

Bu çərçivədə, Ustad Nursi, İlahi fellərdən arının xilqətinə yönələn fel və sənətin, arının müdafiə mexanizmində möcüzə bir keyfiyyət ortaya qoyduğunu bizə göstərməkdədir.[1]

1 Şualar, s.131

***«Rəbbin bal arısına belə vəhy etdi: "Dağlarda, ağaclarda və insanların düzəltdikləri çardaqlarda özünə pətəklər hör. Sonra bütün meyvələrdən ye və Rəbbinin səndən ötrü asanlaşdırdığı yollarla get".***

***O arıların qarınlarından tərkibində insanlar üçün şəfa olan müxtəlif rəngli bal çıxır. Həqiqətən, bunda düşünən adamlar üçün dəlillər vardır.»*** **(Nəhl/68-69)**

**Təfsiri:**

***«Allah Taala arıya vəhy etdi...»***

Burda qəsd edilən, «ilham» növündən olan vəhydir. Arı, əmrə tabe olaraq halal yediyində, yediyi xoş olur, ondan meydana gələn də, insanlar üçün şəfa olur.

Sonra Allah, məxluqlara üstün qılınmağın, qiyas və haqqı olmaq yolu ilə olmadığını bildirdi. Arıların, boyda və ya surətdə və ya (gözəl rənglərlə) bəzənməkdə, hər hansı bir xüsusiyyətləri yox ikən, insanlar üçün şəfa olan bal, onlardan meydana gəlir.

İnsanın surəti kamil, ağlı və zəkası, tamdır. Üstəlik, insanların arasından peyğəmbərlər və vəlilərə, Allah, xüsusi vəsflər təxsis etmiş (xas qılmış) olduğu halda, insanların bir qismində də -gizli olmayan- bir vəhşət (qəflət və qəriblik) halı yaratmışdır. Halbuki arının nə üstünlüyü vardır ki və ya insanın nə günahı vardır ki? Bu, Allahın bir seçim və təxsisindən (xas qılmasından) ibarətdir.

Bir izaha görə, Allah, sünnətini (kainatdakı qanununu), hər qiymətli şeyi, dəyərsiz şey içində gizləmək üzərə icra etmişdir. Bundan dolayı:

- İpəyi, ipək böcəyində gizləmişdir; halbuki o, heyvanların ən

zəifidir.

• Balı isə, uçanların ən zəifi arıda meydana gətirir.

• İncini, dəniz heyvanlarının ən yabanısı sədəf içində meydana gətirir. Eyni şəkildə,

• Qızıl, gümüş, almazı, daşa yerləşdirmişdir.

• (Allah) Özü haqqındakı mərifət və Allah sevgisini də, möminlərin qəlblərinə yerləşdirmişdir; halbuki onlar arasında, xəta edən və günah işləyənlərdəvardır.[1]

---

1 **Abdu'l-Kərim əl-Quşeyri, «Lətaifu'l-İşarat», Nəhl/68-69 təfsiri**

***"Yer titrəyib (sarsılıb) lərzəyə gələcəyi zaman. Yer öz yükünü bayıra atacağı və insan: "Ona nə olur?"– deyəcəyi zaman – həmin gün yer öz xəbərlərini danışacaqdır. Çünki Rəbbin ona VƏHY edəcəkdir."*** **(Zilzal/1-5)**

**Təfsiri:**

***«...yer öz xəbərlərini danışacaqdır...»***

Yəni yer üzü, o gün, üzərində işlənmiş olan xeyir ya da şər növündən hər cür əməli xəbər verəcəkdir, deməkdir. Bunun:

• uca Allahın sözü olaraq zikr edildiyi, söyləndiyi kimi;

• insanın söyləyəcəyi sözlərin bir qismi olduğu da, söylənmişdir. Yəni insan, heyrət edərək: ***«Bu yerə nə olur ki, xəbərlərini verir?!»*** deyəcəkdir.

Tirmizidə, əbu Hureyrə (radiyallahu anh)'dan belə dediyi rəvayət edilmişdir:

Allah rəsulu (sallallahu aleyhi və səlləm):

***«O gün yer, bütün xəbərlərini danışacaqdır.»*** ayətini oxuyub belə dedi:

***«Onun xəbərlərinin nə olduğunu bilirsinizmi?»***

Səhabələr:

***«Allah və rəsulu daha yaxşı bilir.»*** dedilər.

O (sallallahu aleyhi və səlləm) belə buyurdu:

***«Onun xəbərləri, kişi yaxud qadın hər bir qul haqqında, üzərində***

***işləmiş olduqları əməllərə dair şahidlik etməsi və filan günü, bunu, bunu işlədi, deməsidir. Bax, onun xəbərləri bildirməsi, budur.»***

Tirmizi deyir:

«Bu, həsən-səhih bir hədisdir.»

İmam Mavərdi belə deyir:

Uca Allahın:

***"O gün bütün xəbərlərini danışacaqdır."*** buyuruğu haqqında, 3 görüş vardır:

"O gün bütün xəbərlərini danışacaqdır."

Yəni üzərində qulların işlədikləri əməlləri, bildirəcəkdir.

Bu görüş, əbu Hureyrənin görüşü olub, o, bunu, (Allah rəsuluna aid) mərfu bir hədis olaraq da rəvayət etmişdir. Bəhsi keçən ***"titrəmək, sarsıntı keçirmə"***yin, qiyamət sarsıntısı olduğunu mənimsəyənlərin görüşü də, budur.

Yer, bayıra çıxaracağı yükləri ilə, xəbərlərini bildirmiş olacaqdır.

Bu izahı, Yəhya b. Səllam vermişdir. Sarsıntının***: "qiyamətin əlamətlərindən olan sarsıntı"*** olduğunu qəbul edənlərin görüşü, budur.

Mən (Qurtubi) isə, deyirəm ki:

Abdullah b. Məs'udun, Allah rəsulu (sallallahu aleyhi və səlləm)'dən rəvayət etdiyi hədis, bu mənadadır. Nəbi (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

***"Bir qulun əcəli bir yerdədirsə, ehtiyacı onu ora getməsini təmin edər. Nəhayət, çatacağı ən iləri nöqtəyə vardığında, Allah, onun ruhunu qəbz edər. Yer, qiyamət günündə:***

***'Rəbbim, Sənin mənə əmanət olaraq buraxdığın budur.' deyəcəkdir."***

Bu hədisi, ibn Macə, Sünən'ində rəvayət etmiş olub, daha əvvəl, Loğman surəsi 34-cü ayətin təfsirində keçməkdədir.

"İnsan: buna nə olur?" deyə soruşacağı zaman, qiyamətin qopacağını xəbərverəcəkdir.

Bu açıqlamanı da, ibn Məsud vermişdir.

O, dünyanın işinin artıq bitdiyini, axirətin gəlmiş olduğunu xəbər verəcəkdir.

Beləliklə, yer, onların sual soruşmaqlarına müqabil olaraq, bu sözü ilə cavab vermiş olacaqdır. Bu, kafirlər üçün bir təhdid, möminlər üçün qorxulma və xəbərdarlıqdır.

Yerin, xəbərlərini danışması xüsusunda da, 3 görüş vardır:

Uca Allah, yeri, danışan bir canlıya çevirəcəkdir. O da, bunu söyləyəcəkdir.

Uca Allah, yerdə, danışmaq xəlq edəcəkdir.

Yerdə, danışmağın yerini tutacaq şəkildə bir açıqlama olacaqdır.

Təbəri deyir:

- Zəlzələ ilə;
- Sarsılmaq ilə; və
- Ölüləri bayıra çıxarmaqla

xəbərlərini açıqlayacaqdır.

***"Çünki Rəbbin ona VƏHY edəcəkdir."***

• Yəni yer, uca Allahın ona vəhyi nəticəsində, xəbərlərini bildirəcəkdir.

***“Ona VƏHY edəcəkdir.”*** buyuruğunun:

• ***“ona əmir verəcək”*** mənasında olduğu da söylənmişdir. Bu açıqlamanı, Mücahid vermişdir.

Süddi də:

***“Ona VƏHY edəcəkdir.”:***

• ***“Ona deyəcəkdir.”*** deməkdir, deyə açıqlamışdır.

Mənanın belə olduğu da söylənmişdir:

• Sarsıntının olacağı və yer üzünün, yüklərini çıxaracağı gün, yer, xəbərlərini söyləyəcək, üzərində işlənmiş olan xeyir və şərri bildirəcəkdir.

Bu izah, Sevri və başqasından rəvayət edilmişdir.(1)

1 ***Qurtubi, “əl-Cami li Ahkami’l-Quran”, Zilzal surəsi təfsiri***

***«O, iki gündə onları yeddi göy kimi yaratdı və hər göyə, ona məxsus olan əmri VƏHY etdi. Biz dünya səmasını qəndillərlə bəzədik və mühafizəmizə götürdük.***

***Bu, Qüdrətli və Bilən Allahın əzəli hökmüdür.»*** **(Fussilət/12)**

**Təfsiri:**

***«Hər bir göyə, ona aid olan əmri VƏHY etdi...»*** buyuruğu haqqında, Qatadə və Süddi, belə deyirlər:

***«Hər birində, günəşini, ayını, ulduzlarını və orbitlərini yaratdı. Hər bir səmada, ora aid olan mələkləri və içində dənizlərin, dağların, dolu və qarların mövcud olduğu məxluqları yaratdı.»***

İbn Abbasın görüşü də, budur. O, belə deməkdədir:

***«Uca Allahın, hər səmada, mələklərin həcc və tavaf etdikləri və Kəbə səviyyəsində yerləşən bir evi vardır. Dünya səmasında isə, Beytu'l-Mə'mur'dur.»***

Bir başqa açıqlamaya görə, Allah, hər bir səmada vəhy endirdi. Yəni, orda istədiyi şeyləri və əmr etdiyi xüsusları vəhy etdi.

Vəhy etmək, əmr vermək mənasında ola bilər. Çünki uca Allah belə buyurmaqdadır:

***«Çünki Rəbbin ona (yerə) vəhy edəcəkdir.» (Zilzal/5)***

Bir başqa yerdə də:

***"Bir zaman Mən həvarilərə: "Mənə və elçimə iman gətirin!"– deyə VƏHY etmişdim..."***

Bu da, ***"onlara əmr etdim"*** mənasındadır və bu əmir, təkvini

(yaradılışa dair) bir əmrdir.[1]

---

1 **(Qurtubi, "əl-Cami li Ahkami'l-Quran", Fussilət/12 təfsiri)**

***“O, iki gündə onları yeddi göy kimi yaratdı və hər göyə, ona məxsus olan əmri VƏHY etdi. Biz dünya səmasını qəndillərlə bəzədik və mühafizəmizə götürdük.***

***Bu, Qüdrətli və Bilən Allahın əzəli hökmüdür.”*** **(Fussilət/12)**

**Təfsiri:**

• Muqatil, burdakı ***“vəhy etdi”*** ifadəsinə: ***“Allah, hər göydə, istədiyini əmr etdi.”*** mənasını vermişdir.

• Qatadə də:

***“Hər göydə, oranın günəşini, ayını və ulduzlarını yaratdı***.” demişdir.

• Süddi isə:

***“Allah, hər göydə mələklər, dənizlər və buz dağları və bənzəri məxluqatı yaratdı.”*** deyir və belə davam edir:

***“Allahın, hər göydə -mələklərin hər birinin, özünə yönəlib tavaf etdiyi-***

***bir beytullahı vardır. Bu beytullahlardan hər biri, Kəbə səviyyəsinə (paralelinə) düşməkdədir. Əgər onlardan bir daş düşəcək olsa, Kəbəyə düşər.”***

• Doğruya ən yaxın olan, belə deyilməsidir:

Nəhv elmində, bir şeyin bir şeyə izafə edilməsi (nisbət edilməsi) üçün, kiçik bir səbəbin kifayət edəcəyi hökmü vardır. Allah Taalanın, hər göy əhlində, bəlli mükəlləfiyyətləri vardır. Bu cümlədən olaraq:

• bəzi mələklər, bu aləmin yaradılışından qiyamətə qədər qiyamda;

• bəziləri, başlarını qaldırmadan rükuda;

• bəziləri də, yenə eyni şəkildə səcdədədirlər.

Məsələn, bir iş, bir göy əhlinə məxsus olunca, bu iş, o göydəkilərin işi olmuş olur. Bundan dolayı, Haqq Taalanın:

***"Allah, hər göyə, ona aid əmri (işi) vəhy etdi."*** ayətinin mənası:

***"Allah, hər göyə, ona aid olan işi vermişdir***." şəklində olur. (1)

---

1 **Fəxrəddin ər-Razi, "Məfatihu'l-Ğeyb" təfsiri, Fussilət/12 təfsiri**

***"O zaman Rəbbin mələklərə: "Mən sizinləyəm! İman gətirənlərə səbat verin (ilham edin). Mən kafirlərin qəlbinə qorxu salacağam. Onların boyunlarını vurun və barmaqlarının hamısını kəsin!"– deyə VƏHY etmişdi."*** **(Ənfal/12)**

Təfsiri:

***"Mələklərin möminlərə səbat verməléri"***

...daha sonra Allah Taala:

***"İman edənlərə səbat ilham edin..."*** buyurmuşdur.

Alimlər, burda bəhs edilən "səbat vermə"yin necə olduğu xüsusunda, bəzi fərqli görüşlər bəyan etmişlərdir:

Mələklər, Allah rəsulu (sallallahu aleyhi və səlləm)'ə, Allahın, möminlərin köməkçisi olduğunu bildirmişdilər. Peyğəmbər (sallallahu aleyhi və səlləm) də, bunu, möminlərə xəbər vermişdi. "Səbat vermə"yin mənası da, budur.

Necə ki, şeytanın insana vəsvəsə verməsi mümkündürsə, eyni şəkildə, mələklərin də, insanlara ilham verməsi mümkündür. Burdakı "səbat vermə"yin mənası da, budur.

Mələklər, möminlərə, onların tanımış olduqları (aşina olduqları) kimsələrin surətinə girmiş olaraq görünür və onlara müzəffəriyyət, fəth və zəfər xüsusunda yardım edirlərdi.[1]

---

**1 Fəxrəddin ər-Razi, "Məfatihu'l-Ğeyb" təfsiri, Ənfal/12**

# 2. Hədislərdə İlham

**3689** - Əbu Hureyrə (radiyallahu anh)'dan rəvayət edildiyinə görə, Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

***"Sizdən əvvəlki ümmətlər arasında, muhaddəs insanlar vardı. Əgər Mənim ümmətim arasında (belə) biri olacaqsa, şübhəsiz ki, o, Ömərdir."***

(**Not:** Bu hədisi, Buxari, 60-cı kitab: "Nəbilərə dair hədislər kitabı"nda, 54-cü babda, hədis no: 3469 no-lu hədis olaraq da rəvayət etmişdir.)

Əbu Hureyrə (radiyallahu anh)›da rəvayət edildiyinə görə, Nəbi (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

***"And olsun ki, sizdən əvvəlkilər arasında -yəni İsrail oğulları arasında- nəbi olmadıqları halda, özlərilə danışılan adamlar vardı. Əgər Mənim ümmətim arasında onlardan biri varsa, o da, Ömərdir."***

İbn Abbas (Həcc surəsi 52-ci ayətdə keçən: «və lə nəbiyyin» buyuruğunu:

***"...bir peyğəmbər və bir muhaddəs..."*** deyərək ("bir muhaddəs" ləfzini əlavə edərək) oxumuşdur.

**İzahı:**

***"Muhaddəsun"*** ləfzi, «muhaddəs» kəliməsinin cəm halıdır. Bunun açıqlaması xüsusunda, fərqli görüşlər vardır:

• ***"Özünə ilham olunan kimsə"*** deyə açıqlanmışdır. Əksəriyyətin görüşü də, budur.

• ***"Xüsusi bir məqsəd olmamaqla birlikdə, dilindən doğru şeylər tökülən kimsədir."*** deyə də, açıqlanmışdır.

***"Şübhəsiz Allah, haqqı, Ömərin dili və qəlbi üzərinə qoymuşdur."*** hədisi də, bunu dəstəkləməkdədir. Bu hədisi, Tirmizi, ibn Ömər təriqi ilə rəvayət etmişdir.[1]

---

1 **İbn Həcər Asqalani, "Fəthu'l-Bari bi şərh-i Sahihil-Buxari", 62-ci kitab: "Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in səhabələrinin fəzilətləri kitabı", 6-cı bab: "Ömər b. əl-Xattab, əbu Hafs əl-Quraşi əl-Adəvi (radiyallahu anh)'ın tərifə layiq xüsusiyyətləri babı"**

**6154** - Aişə (radiyallahu anha)'dan rəvayət edildiyinə görə, Nəbi (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

***"Sizdən əvvəlki ümmətlər arasında, muhaddəs kimsələr vardı. Əgər Mənim ümmətim arasında (belə) biri varsa, şübhəsiz ki, o, Ömərdir."***

Şərhi:

Elm adamları, ***"muhaddəsun"*** ilə nə qəsd edildiyi xüsusunda, ixtilaf etmişlərdir:

• ibn Vehb: ***"İlham edilənlər"*** deyə açıqladığı kimi;

• ***"İsabət edənlər"*** deyə də açıqlanmışdır. Bir xüsusda, bir zənn üzərə olduqları vaxt, sanki onlara bir şey ilham edilmiş və onlar da o zənn üzərə olmuşlardır.

• ***Onlarla, mələklərin danışdığı*** da söylənmişdir. Bir rəvayətdə də, ***"mutəkəlləmun": "özlərilə danışılanlar"*** deyə qeyd edilmişdir. Buxari də:

***"Doğruluq, onların dilindən tökülər."*** deyə açıqlamışdır.

Hədisdə, övliyanın kəramətlərinin sabit olduğu dilə gətirilməkdədir.[1]

---

1 **Nəvəvi, "əl-Minhac fi şərh-i Sahih Muslim b. Haccac", 44-cü kitab: "Səhabələr (radiyallahu taala anhum)'un fəzilətləri kitabı", 2-ci bab: "Ömər (radiyallahu anh)'ın fəzilətlərindən bəzilərinə dair bab"**

İmran b. Husayn (radiyallahu anh)›dan belə rəvayət edilir:

- Allah rəsulu (sallallahu aleyhi və səlləm), atama, belə buyurdu:

***“Ey Husayn! Neçə ilaha ibadət edirsən?”***

- Atam:

***“7 ilaha. Altısı yer üzündə və biri də göydə.”*** deyə cavab verdi.

- Allah rəsulu (sallallahu aleyhi və səlləm) ona, belə dedi:

***“(Başına bir bəla-müsibət gəldiyində), hansına sığınırsan?”***

- Atam:

***“Göydəkinə.”*** deyə cavab verdi.

- Allah rəsulu (sallallahu aleyhi və səlləm), ona, belə dedi:

***“Ey Husayn! Əgər müsəlman olarsansa, sənə 2 kəlimə öyrədərəm, ki, bu, sənə fayda verər.”***

- Husayn müsəlman olduqdan sonra:

***“Ey Allahın rəsulu! Mənə söz verdiyin o 2 kəliməni öyrət***.” dedi.

- Allah rəsulu (sallallahu aleyhi və səlləm), belə dedi:

***“De ki: Ey Allahım! Mənə rüşdümü ilham et və nəfsimin şərrindən qoru!”***

**Not:** Hədis, həsən-qəribdir.

**Şərhi**:

Nəbi (sallallahu aleyhi və səlləm) səhabədən Husayn (radiyallahu anh)’a, bu duanı öyrətmişdir. Bu duanı öyrətməsi, onun əhəmiyyətinə

işarət etməkdədir.

**Rüşd:** Tam bir hidayət və salah üzərə olmaqdır. Uca Allah, kimə rüşd verərsə, o kəsi, bütün xeyirli işlərə müvəffəq qılar və həlak edici günahlardan mühafizə edər. Çünki uca olan Allah belə buyurmaqdadır:

***"Bilin ki, Allahın Elçisi aranızdadır. Əgər o, bir çox işlərdə sizə güzəştə getsəydi, çətinliyə düşərdiniz. Lakin Allah sizə imanı sevdirmiş, onu qəlbinizə gözəl göstərmiş, sizdə küfrə, günaha və asi olmağa qarşı nifrət oyatmışdır. Doğru yolda olanlar (raşidun, rüşd sahibləri) da bunlardır."*** **(Hucurat/7)**

Nəbi (sallahu aleyhi və səlləm), bu duada rüşdü istəməyi öyrətdikdən sonra, rüşdün ziddi olan xüsusu, yəni nəfsin şərrini də zikr etmişdir. Nəfsu'l-əmmarə (pisliyi əmr edən nəfs), insana, mütəmadiyən, pisliyi əmr edər. Bundan dolayıdır ki, duanın davamında:

***"...və Məni, nəfsimin şərrindən qoru."*** deyə söyləməsini əmr etmişdir. Çünki uca olan Allah, quluna rüşdünü ilham etsə də, nəfsi, özünü ibadətlərdən uzaq tuta bilər, yaxud gözəllik və xeyirləri özünə sevimli gəlməyə bilər.

Bundan dolayı, Nəbi (sallallahu aleyhi və səlləm), səhabəsinə, öz nəfsinin şərrindən Allaha sığınmasını öyrətmişdir. Beləcə, qul, Rəbbinə itaət etməyin dadına varacaq, rahat bir qəlblə xeyirli və yaxşı işlərə yönələcəkdir[1].

## Həsən-qərib hədis, nə deməkdir?

***"Həsən"*** hədis terminini ilk dəfə bir hədis növü olaraq istifadə edən Tirmizi, bəzən ***"həsən"*** termini ilə bərabər başqa bir məfhum da

**1 Tirmizi, Sünən, Daavat/70, hədis no: 3550**

istifadə edir. ***“Həsən-qərib”*** termini, bunlardandır.

İmam Tirmizi, Sünəndə (başqa adı ilə «əl-Cami» əsərində), -həsən hədis xaric-, istifadə etdiyi terminlərin heç biri haqqında məlumat verməmişdir. Bu səbəblə, hədis alimləri, onun ***“həsən-qərib”*** termininin mənasını açıqlamağa çalışmışlardır. Ancaq mühəddislər, termin olaraq istifadə edilən bu məfhumun məqsədi haqqında, ehtimallar üzərində dayanmaqdan irəli gedə bilməmişlərdir. Bundan dolayıdır ki, aralarında ixtilaflar meydana gəlmişdir.

İslam alimlərinin ***“həsən-qərib”*** istilahının mənasını açıqlamaq üzərə söylədiklərinə yer vermədən əvvəl, bu təbirin istifadə şəklini misal üzərində görmək, yerində olacaqdır:

İbn Abbas (radiyallahu anh)›dan belə rəvayət edilir:

Nəbi (sallallahu aleyhi və səlləm):

***“2 gözə, əsla cəhənnəm atəşi toxunmaz:***

***• Biri: Allah qorxusu ilə ağlayan göz;***

***• Digəri: Allah yolunda növbət tutan göz.”***

Əbu İsa (Tirmizi) dedi:

***“İbn Abbasın bu hədisi, həsən-qərib bir hədisdir.”***

Tirmizinin ***“həsən-qərib”*** termini ilə qəsd etdiyi mənanın açıqlamasına gəlincə, Təqiyuddin Əhməd b. Teymiyyə, bir fətvasında, Tirmiziyə, bəzi sabit olmamış terminləri istifadə etməsindən dolayı tən edənlərin, söylədiklərinin əksəriyyətini nə məqsədlə söylədiklərini bilməyənlər olduqlarına işarət etdikdən sonra, belə deyir:

***“Mühəddislər, bəzən: ‘həzəl-hədisu qaribun’ deyirlər. Bu ifadə, ‘hədis, bu yöndən qəribdir.’ deməkdir. Hətta bəzən, bunu özləri***

***açıqlayaraq, 'bu yöndən qəribdir.' təbirini, özləri də istifadə edirlər. Bu təqdirdə hədis, mühəddislər nəzərində, tək təriqdən gələn məruf bir səhih hədisdir. Əgər başqa təriqdən də rəvayət edilərsə, mətni səhih və məruf olsa belə, digər yöndən qərib sayılır.***

***Buna görə, Tirmizi, bir hədis haqqında 'həsənun qaribun' dediyi zaman, bununla, o hədisin o təriqdən qərib olduğunu qəsd etmişdir. Ancaq mətnin şahidi vardır və onlarla həsən cümləsindən olmuşdur."***

İbn Teymiyyə, bir başqa yerdə, eyni mövzuda:

1. "Qərib" hədisin: yalnız bir rəvayət isnadı ilə bilinən hədis;

2. "Həsən" hədisin isə: Tirmiziyə görə,

• 2 yöndən rəvayət edilən hədis olduğuna;

• raviləri arasında yalançılıqla ittiham edilmiş bir ravi mövcud olmaması ilə bərabər;

• şazz olmaması gərəkdiyinə

işarət etdikdən sonra, belə deyir:

***"Bəzi kimsələr, Tirmizinin, "həsən" ismini verdiyi hədislərin, (yuxarıdakı) bu təvsifə münasib olmadığını söyləmişlərdir. Məsələn, haqqında "həsən-qərib" dediyi hədislər, bunlardandır və yalnız, bir tək isnadla rəvayət edilmişlərdir. Tirmizi, bunlara da "həsən" demişdir. O halda, bunun izahı belə olmalıdır:***

***"Hədis, bir tabi'i'dən rəvayət olunduğu üçün, "qərib" sayılır. Lakin bu tab'i'i'dən 2 yöndən rəvayət edilincə, təriqlərin, tab'i'dən etibarən çoxalması səbəbilə, "həsən" olur. Əslində isə, hədis, qəribdir."***

Bu hala görə, Tirmizinin, bir hədis haqqında istifadə etdiyi ***"həsən-***

***qərib”*** terminindən məqsəd, ibn Teymiyyəyə görə, hədisin:

- isnadının bir mərhələsinə qədər- qərib;
- o mərhələdən etibarən də- həsən olmasıdır.

İmam Zərkəşiyə görə isə, hədisin:

- mətn yönündən- həsən;
- isnad yönündən isə- qərib olmasıdır.

# Hüccətül-İslam imam əbu Həmid əl-Ğazzalinin ilham bəhsindəki açıqlamaları

***Zəruri olmayan elmlərin, bəzi hallarda gerçəkləşməkləri, fərqlilik göstərir:***

• Bəzən qəlbə hücum edir ki, hardan gəldiyi bilinməyəcək şəkildə, qəlbə buraxılır.

• Bəzən də, dəlillərə baş vurmaq və öyrənməklə əldə edilir.

• Çalışmadan və dəlil çarəsinə baş vurmadan qəlbdə doğan elmə, **"ilham";**

• Dəlilə baş vurmaq surətilə əldə edilən elmə də ***"i'tibar"*** və ***"istibsar"*** adı verilir.

Sonra, qulun hər hansı bir səyi, öyrənmə cəhdi olmadan qəlbinə doğan elmlər də:

***1. Özünə necə və hardan bəxş edildiyini bilmədiyi elmlər;***

***2. Səbəbini bildiyi elmlər***

olmaq üzərə, ikiyə ayrılır. Bu ikinci bənd, qəlbə ilham edən mələyi görməklə gerçəkləşir.

• **Birincisinə** (özünə necə və hardan bəxş edildiyini bilmədiyi elmlərə): ***"ilham"*** və ***"qəlbə üfləmək";***

• **İkicisinə** (səbəbini bildiyi elmlərə) də: ***"vəhy"*** adı verilib, peyğəmbərlərə xasdır.

İlk işarət edilən, yəni dəlillə təmin edilən (dəlilə baş vururularaq

əldə edilən) elm isə, alimlərə məxsusdur.

Burda söylənilləcək həqiqət budur:

Qəlb, bütün nəsnələrin (şeylərin) həqiqətlərinin, özündə təcəlli etməsinə istedadlı bir özəllikdədir. Ancaq daha əvvəl toxunduğumuz 5 səbəbdən biri, qəlb ilə həqiqətlər arasına girərək, bu həqiqətlərin təcəllisinə mane olur.[1]

1 İmam Ğazzali, bu 5 səbəbi belə sıralayır:

"Bir ayna, aşağıdakı bu 5 səbəbdən ötrü, göstərməz:

**1.** Daha hələ dəmir cövhəri mövqeyində olub ayna mövqeyinə gətirilmədiyi: «şəkli nöqsanlığ»ından ötrü;

**2.** Şəkli tam olmaqla bərabər, üzünün kirli və paslı olmasından ötrü;

**3.** Aynanın, üzərində göstərilməsi istənilən surətin yönündə olmaması; surətin, aynanın arxasında qalması səbəbilə;

**4.** Ayna ilə surət arasında bir pərdənin asılmış olmasından ötrü;

**5.** Ayna üzərində göstərilməsi istənilən surətin olduğu yönün bilinməməsindən ötrü.

Bax qəlb də belədir. Bütün hadisələrdə, həqiqətin içinə təcəlli edəcəyi, üzərində göstərə biləcəyi ayna mövqeyindədir. Ancaq qəlblər, aşağıda sayılacaq, 5 səbəbdən ötrü, elmlərdən yoxsul qalırlar:

• **Birincisi:** Zatındakı nöqsanlıqdan dolayı.

Məsələn, uşaqların qəlbi, belədir. Uşağın qəlbi, hələ elmlərin təcəlli edəcəyi bir mərtəbədə deyildir. Bu cəhətdən, uşaqların qəlblərində bilinən şeylərin yansımaları (görünmələri), gerçəkləşmir.

• **İkincisi:** Şəhvətlərin çoxluğu səbəbilə, qəlb səthində, günah və çirkabların qatılaşması.

Bu da, qəlbin parlaqlığını əngəlləyir. Qatı bir qaranlıq içində qaldığından, belə bir qəlbdə, həqiqətin zuhuru (doğması), mümkün olmur. Bu həqiqətə, Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in bu sözlərilə işarət olunmuşdur:

***"Bir günah işləyəndən, bir də özünə geri qayıtmamaq üzərə, ağlı ondan ayrılar."***

Yəni, (hədisin mənası) bu deməkdir ki:

Günah işləyən şəxsin qəlbində, izi hər zaman qalacaq bir ləkə meydana gəlir. Çünki, günah işləyənin məqsədi, günahının arxasından onu siləcək bir yaxşılıq etməsidir (yəni yaxşı əməl görməsidir).

Əgər o şəxs, günah etmədən əvvəl, bir xeyir əməl gerçəkləşdirmiş olsaydı, şübhəsiz, qəlbinin parlaqlığı artardı. Ancaq, əvvəlcədən günah işləyincə, yaxşı davranışının faydası düşür; qəlb, daha sonra edilən xeyirli bir işlə, aydınlığı, parlaqlığı artmamış bir halda, əvvəlki halına qayıdır. Bu isə, açıq bir zərər, ortadan qaldırılması mümkün olmayan bir əskiklikdir.

Bəli, kirlənib originallığını itirən bir ayna, nə qədər parladılarsa, parladılsın, hələ kirlənməmiş, original bir aynanın parlaqlığını qazana bilməz.

Bundan dolayı, Allaha yönəlmək və şəhvətlərin gərəklərindən uzaqlaşmaq, qəlbi cilalayıb parladır. Bundan ötrü, Allah Taala:

***"Uğrumuzda cihad edənləri mütləq Öz yolumuza yönəldəcəyik. Şübhəsiz ki, Allah xeyirxah əməl sahibləriylədir." (Ənkəbut/69)***

buyurduğu kimi, Allah rəsulu (sallallahu aleyhi və səlləm) də belə demişdir:

***"Bildiklərilə əməl edən kimsəyə, Allah, bilmədiyi elmi bəxş edər."***

• **Üçüncüsü:** Qəlbin, istənilən həqiqət yönündən (mətlub olan həqiqətdən) azdırılmasıdır. İtaətkar və dürüst bir şəxsin qəlbi təmiz olsa da, qəlbində, haqqın açıqlığı tam görünməz. Çünki haqqın arxasında olmadığı kimi, qəlb aynasını da, tam istənilən yönə tutmamışdır.

Daha doğrusu, belə biri, bütün düşüncəsini, bədəni ibadətlərin təfərrüatlarına və ya məişət səbəblərini hazırlamağa həsr edər; fikrini, Rububiyyət (Allahın bütün hər şeyi tərbiyə ediciliyi) hüzurunda və gizli İlahi həqiqətlər mövzusunda düşünməyə yönəltməz.

Bu səbəblə, onun qarşısına -əgər beyin sındırarsa- əməllərin incə afətlərilə, nəfsin gizli ayıbları və ya məişət çarələrinin nələr olduğu sərilər.

Düşüncəni ibadət və itaətlərin təfərrüatlarına həsr etmək, Haqqın qəlbdə təcəllisinə əngəl olduğuna görə,

bütün fikirlərini, dünyəvi şəhvətlərini gerçəkləşdirməyə yönəldənlər haqqında, bir özün düşün...

Belələri, həqiqi kəşfdən (qəlb gözünün açılması ilə, başqalarına qapalı olan

Bu, sanki, qəlb aynası ilə, qiyamətə qədər baş verəcək hadisələrin xüsusların görülməsi, kəşf edilməsindən) necə məhrum buraxılmasınlar?!

**• Dördüncüsü:**

Hicab, yəni pərdədir. Şəhvətlərinə qalib gəlib, özünü, həqiqətlərdən biri üzərində düşünməyə vermiş itaətkar biri də, bəzən, düşündüyü həqiqəti kəşf edə bilmədiyi də olur.

Bunun səbəbi də, uşaqlığından bəri, təqlid yolu ilə və yaxşı niyyətlə mənimsədiyi bir inancıdır. Bu da, o şəxs ilə, Haqqın həqiqəti arasına girən və zahiri təqlidinin xilafına olan bir şeyin, qəlbində kəşf edilməsini əngəlləyir.

Bəli, bu da, böyük bir əngəldir.

Kəlam əhli ilə, məzhəb təəssübkeşlərinin əksəriyyəti, bu bəlaya düçar olmuşlardır;

Hətta göylərin və yerin qeyr-i adilikləri mövzusunda təfəkkür edən saleh şəxslərin əksəriyyəti belə, bu dərdə tutulmuşlardır.

Çünki təqlidçilikləri, ruhlarında donmuş, qəlblərində kökləşmiş və bu təəssübkeş davranışları, özlərilə həqiqətləri idrak etmələri arasında maneə olmuşdur.

**• Beşincisi:**

Arxasınca düşülən şeyin, hansı yöndən əldə ediləcəyinin bilinməməsidir.

Çünki elm arxasınca gedənin, məchulla elm əldə etməsi, mümkün deyildir. Elm əldə etməsi, hədəflərilə uyğun düşən elmləri xatırlaması ilə mümkün olur.

Bunları düşünər və özünə görə, alimlərin diqqətə alıb bildikləri bir tənzimləmə edərsə (yəni dissiplin qurarsa), istənilən yönü tapmış olar. Bunun nəticəsində də, mətlub olunan şeyin həqiqəti, qəlbində parlayar. Çünki arxasınca düşülən elmlər, fitri deyildirlər, bunları ovlamağın, əldə etməyin yolu, "elmi torları aralamaq"dır.

Daha doğrusu, bütün elmlər, özlərindən əvvəl mövcud olan, bir birilərilə münasib olan və xüsusi şəkildə cütləşən, 2 elmdən meydana gəlir. Cütləşən bu 2 elmin izdivacından, üçüncü bir elm əldə edilir. Bu, eynilə, kişi ilə qadının birləşməsindən, üçüncü bir varlığın meydana gəlməsi hadisəsini xatırladır.

Bunu da əlavə edək:

Bir dayça əldə etmək istəyən, bunu, bir eşşəkdən, bir dəvədən və bir insandan əldə edə bilməz. Dayça əldə edə bilmək üçün, soyunun, at və madyan ilə birləşdirilməsi gərəkdir. Dayça, bunların birləşməsindən meydana gəlir.

bütününün nəqş edildiyi "lövh-i məhfuz" arasında asılmış bir pərdə kimidir. Elmlərin həqiqətlərinin, lövh-i məhfuz aynasından qəlb aynasına əks etməsi, bir aynadakı surətin, qarşısındakı aynanın içində görülməsini xatırladır. 2 ayna arasındakı pərdə, bəzən "əl" ilə, bəzən də "küləyin təsiri" ilə açıla bilir.

Eynilə bunun kimi, bəzi vaxtlar, (Allahın) "ehsan külələri" əsərək, qəlb gözlərindən pərdələri qaldırır və lövh-i məhfuzda yazılan bəzi şeylər, qəlbə əks etdirir. Bu, bəzən yuxuda olur və bu şəxs də, gələcəkdə olacaq bəzi şeyləri, bu sayədə (yəni mövcud pərdənin aradan qalxması ilə) bilir. Bu isə, qulun iradəsində deyildir.

Bu cəhətdən, vəhy də, ilhamdan ayrılmaz. Ayrıldıqları cəhət, elmi

---

Hər elm də belədir. Hər elmin kökü və bu 2 kök arasında cütləşmə yolu, metodu vardır. Bunların cütləşmələrindən istifadəyə əlverişli mətlub elm təmin edilir. Bu kökləri (qaynaqları) bilməmək, cütləşmənin keyfiyyətindən xəbərdar olmamaq, elmi əngəlləyən faktordur. Bunun nümunəsi, yuxarıda bildirdiyimiz kimi, surətin, hansı yöndə olduğunun bilinməməsidir.

Bunu, belə bir təmsillə açıqlamağımız, daha isabətli olacaq:

Boynunu görmək istəyən şəxs, söz gəlişi:

• aynanı üzünə tutarsa, boyun nahiyəsini görə bilməyəcək;

• aynanı ənsəsinə tutarsa, bu səfər də, nə aynanı, nə də orda görünən ənsəsini görə biləcək.

Elə isə, bu şəxsin, ənsəsini görə bilməsi üçün, ikinci bir aynaya ehtiyac vardır. Aynanın birini önündə, digərini də ənsəsində, tam onun qarşısında tutduğunda, qarşılıqlı görsənmələrilə, məqsədinə çatacaq.

Bax elmləri əldə etməyin də, belə qəribə yolları, metodları vardır.

Bu metodlar, ayna təmsilində bildirdiklərimizdən çox daha qəribə azmaq və sapmaqları da ehtiva edir. Yer üzündə isə, bunların fərqinə varıb tədbir ala biləcək kimsələr də, çox azdır. Hadisələrin həqiqətlərinin qəlblərdə təcəllisini əngəlləyən səbəblər, bax bunlardır. Yoxsa əslində hər qəlb, təbiəti gərəyi olaraq, həqiqətləri qavramağa əlverişlidir...

gətirən mələyin görülməsi keyfiyyətidir. Çünki elm, qəlblərimizə, mələklər vasitəsilə girməkdədir. Bu həqiqətə, Şura surəsinin 51-ci ayətində, belə işarət edilmişdir:

***"Allah insanla ancaq vəhylə və ya pərdə arxasından danışır, yaxud bir elçi göndərir və o da Allahın izni ilə Onun istədiyini vəhy edir. Həqiqətən, O, Ucadır, Müdrikdir."***

Bunları başa düşdünsə, bu xüsusa diqqət et:

(Bəzi) Tasavvuf əhli (sufilər), təhsillə qazanılan elmə deyil, ilhami elmlərə meyl göstərir, bu cəhətdən, elm öyrənməyə, təsnif və təlif sahiblərinin yazdıqları əsərləri mütaliəyə, irəli sürülən görüşləri və gətirilən dəlilləri araşdırmağa, maraq göstərmirlər. Hətta belə deyirlər:

"Yol:

• nəfslə cihada əhəmiyyət vermək;

• zəmm edilmiş (pislənmiş) sifətləri yox etmək;

• dünya ilə bütün bağları qoparmaq; və

• himməti, bütünü ilə sadəcə Allah Taalaya yönəltməkdir.

Bu reallaşdığında, Allah, qulunun qəlbini Öz üzərinə götürər və oranı, elm nurları ilə aydınlatmağı, Öz öhdəsinə alar. Allahın Öz üzərinə aldığı qəlbə də:

• rəhmət axın edər;

• belə bir qəlbdə nur parıldayar;

• sinə genişlənər;

• mələkut aləminin sirləri kəşf edilmiş olar;

• (Allahın) rəhmət lütflərilə, qəlbin üzündən qürur pərdəsi sıyrılar;

• qəlbdə İlahi əmrlərin həqiqətləri parıldayar.

Elə isə, qulun vəzifəsi:

• sırf qəlbini təmizləməklə hazırlıq etmək;

• səmimi bir şəkildə İlahi varidata yönəlmək, tam susamaq; və

• mütəmadi bir şəkildə, Allahın göndərəcəyi rəhməti gözləməkdir.

Peyğəmbərlər ilə vəlilərin qarşılarına həqiqətlər sərilmiş, sinələrinə nurlar axıdılmışdır. Bu, nə elm öyrənməkləri, nə də kitab yazmaqları sayəsində olmuşdur. Əksinə:

• dünyada zahidliyi tərcih etməkləri;

• dünyəvi münasibətlərdən sıyrılmaqları;

• qəlblərini dünya məşğələlərindən təmizləməkləri;

• bütün himmətlərilə Allaha yönəlməkləri

sayəsində reallaşmışdır.

Uzun sözün qısası, (yəni deyirlər ki):

***“Kim, Allah üçündürsə, Allah da onun üçündür.”***

(Bəzi) Tasavvuf əhli, bu vadidəki ilk yolun:

• dünya ilə münasibətləri tamamilə kəsmək;

• qəlbi dünyadan boşaltmaq;

• ailə, mal, uşaq, vətən, elm, hökmranlıq, qəlblərdə yer etmək sevdalarından sıyrılmaq

olduğunu söyləyib, belə deyirlər:

“İnsan, elə bir hala gəlməlidir ki:

• nəzərində əşyaların varlıqları ilə yoxluqları bərabər olmalı;

• öz başına bir küncə çəkilib fərz və sünnət namazları qıldıqdan sonra, boş bir qəlblə və bütün himmətini toplamış olaraq oturub, zehnini təfsir oxumaq və hədis kitabları üzərində düşündürüb fikrini dağıtmamalı;

• bütün cəhdini, qəlbinə Allahdan başqa bir şey gətirməməyə həsr etməli;

• tək başına oturub, mütəmadiyən dili ilə və şüurlu bir şəkildə “Allah, Allah” deməli; və elə bir hala gəlməlidir ki, dilini zikirlə oynatmadan, Allah ləfzi, dili üzərindən sürüşüb getməli; sonra Allah ləfzinin əsəri, tamamilə dilindən silinib qəlbinə keçincəyə qədər, bu zikrini davam etdirməli; ardından da, qəlbindən, bu ləfzin surəti, hərfləri, kəlimənin şəkli silinib, sadəcə mənası qalıncaya qədər, qəlbi zikrini davam etdirməli; kəlimənin mənası, qəlbində, mütəmadiyən mövcud olmalı (yəni o mənaya bürünməli), özündən ayrılmayacaq bir mərhələyə gəlincəyə qədər, səbr göstərməlidir.

İnsan, bu mərtəbəyə, öz iradəsilə çata bilər, bu mövqeyinin davam etməsində vəsvəsələri dəf etmək ixtiyarı, əlindədir. Ancaq Allahın rəhmətini cəlb etmək mövzusunda, ixtiyarı yoxdur. O, etdiklərilə, özünü, Allahın «rəhmət külələri»nə ərz etmiş olur, artıq Allah Taalanın açacağı rəhmət qapısını gözləməkdən başqa, əlindən başqa bir şey gəlməz. Allah Taala, peyğəmbərlər və vəlilərə, rəhmətini, bu yolla açmışdır.

Bax bu anda, iradəsi doğru, himməti pak, mütəmadiliyi gözəl olarsa, şəhvətləri özünə təsir etməz, dünya ilə bağlı olaraq nəfsi vəsvəsəyə məruz qalmazsa, Haqqın parıltıları qəlbində parıldayar. Bu parıltılar:

• İlk vaxtlarda, şimşək kimi çaxar, davam etməz, sonra təkrar gələr.

• Bəzən də, çox tez qeyb olar.

• Bəzən davamlılığı uzun çəkər, bəzən də uzun çəkməz.

• Bəzən də, ard-arda bənzərləri görsənər.

• Bəzən də sadəcə bir şəkil üzərə təzahür edər.

Xilqət və təbiəti sayıla bilməyəcək qədər fərqlilik ərz etdiyi kimi, övliyaların bu xüsusdakı mərtəbələri də, sərhəd altına alınmaz. Bu yol:

İlk əvvəl, sənin tərəfindən ləkə qalmayacaq şəkildə təmizlənmənə, durulaşdırıb parıldatmana həvalə edilmişdir. Bu, reallaşdıqdan sonra, sadəcə hazır vəziyyətdə gözləmək qalır.

**Mütəfəkkirlər və ibrət sahiblərinin izahları:**

Bu qrup, bu yolun varlığını, mümkünlüyünü, az da olsa bu metodun, işarət edilən məqsədə çatdıra biləcəyini inkar etməmişlərdir. Peyğəmbərlər ilə vəlilərin əksəriyyətinin halı, belədir. Ancaq bu tayfa:

• bu yolu, çox çətin bir yol olaraq görməkdə;

• (tasavvuf əhlinin) ön gördükləri şərtlərinin bir araya gətirilməsini, uzaq ehtimallar olaraq qəbul etməkdə;

• dünya ilə münasibətin bu dərəcədə kəsilməsini imkansız kimi dəyərləndirməkdə;

• belə bir şey olsa belə, bunun davamının təminindən çox daha çətin olduğunu müdafiə etməkdə; və

• kiçik bir vəsvəsənin, qəlbi alt-üst edə biləcəyini söyləməkdə və bu

hədisləri də, dəlil göstərməkdədirlər:

Allah rəsulu (sallallahu aleyhi və səlləm), belə buyurur:

***1. "Möminin qəlbi, qaynayan qazanın içindəkindən, daha çox fərqlilik göstərər."***

***2. "Möminin qəlbi, Rəhmanın barmaqlarından 2 barmağı arasındadır."***

Bu mücahidə sırasında, təbiət dəyişilə, ağıl qarışa, vücud xəstələnə bilər. Əgər ilk öncə, elmlərin həqiqətlərilə nəfsin riyazəti və təmizlənməsi təmin edilməzsə, qəlbə, bəzi fasid xəyallar öz pəncəsini atar, nəfs də, uzun müddət bunlara güvənər. Bu fasid xəyalları söküb atmak, uzun zaman alar, hətta bir nəticə əldə edilmədən ömür, bitib-tükənər.

Bu yola girən bir çox sufi görülmüş, tək bir xəyala, 20 il ilişib qalanlar olmuşdur. Halbuki bu sufi, daha əvvəl elm əldə etmiş olsaydı, yerindəcə o xəyalın mənşəyinə enər, iltibas etdiyi (qarışdırdığı) nöqtələri, qavrayardı. Bəli, təhsil yolu, ən güvənilən və hədəfə ən yaxın yoldur.

Yenə bu qrup sufilərin bu davranışlarının,

-bir insanın fiqh öyrənməyi tərk edib:

***"Allah rəsulu (sallallahu aleyhi və səlləm), təhsil əldə etməmişdi, təkrarlar və təliqlər etmədən, vəhy və ilham yolu ilə fəqih olmuşdu. Riyazət (nəfsin, tərbiyə məqsədilə, çox yemək və içməyi tərk edərək, faydalı fikirlərlə, ibadətlə məşğul olmaq) və bunda davam etməyim, məni də fiqh alimi olmağa götürər."-***

deməsindən, fərqsiz olduğunu söyləyərlər.

Belə bir zənn daşıyan, özünə zülm etmiş, ömrünü boş yerə xərcləmişdir. Bu düşüncədəki bir şəxs,

-bir dəfinə ilə rastlaşa biləcəyi ümidilə, çalışmağı və əkinçiliyi tərk edən kəndli kimidir.-

Bu, mümkündür; ancaq son dərəcə uzaq bir ehtimaldır.

**Yenə bu qrup (mütəfəkkirlər və ibrət sahibləri):**

İlk əvvəl, alimlərin təhsil etdikləri elmlər təhsil edilib, onların söylədiklərinin anlaşılmasının gərəkdiyini, bundan sonra digər alimlərcə kəşf olunmayan bəzi kəşfləri gözləməkdə, hər hansı bir məhzur (həzər ediləcək hal) olmayacağını, möhtəmələn, elm təhsilindən sonra, mücahidə sayəsində, bəzi həqiqətlərin, gözlər önünə sərilə biləcəyini düşünməkdədir.

**2 məqam arasındakı fərqin, konkret misalla açıqlanması:**

Qəlbin qeyr-i adi halları, hislərin idrak sahəsi xaricindədir. Çünki qəlbin özü də, hiss ilə idrakın xaricindədir. Hislərlə dərk edilə bilməyən şeyi, zehnlər, ancaq, konkret, maddi nümunələrlə qavraya bilirlər.

Biz, məsələni, zəif zehnlərin idrak edə bilmələri üçün, 2 nümunə verəcəyik:

**• Birinci nümunə:**

Bir ərazidə, bir hovuz açıldığını fərz edək. Bu hovuza, üst tərəfində olan dərələrdən yol açılıb su nəql edilməsi möhtəməl olduğu kimi;

√ Yenə bu hovuzun, dadlı suya varıncaya qədər, dərincə qazılıb torpağının atılması və hovuzun dibindən su fışqırması da, möhtəməldir. Həm bu su, daha parlaq, daha mütəmadi, daha dərin və daha bol olur.

Bax:

• qəlb = hovuzu;

• elm =suyu;

• hislər də = dərələri

xatırladır.

Elmlərin:

• hislərdən ibarət olan dərələr və müşahidə yolu ilə ibrət almaq vasitəsilə qəlbə göndərilmələri və bu sayədə qəlbin elmlə dolması mümkün olduğu kimi;

• təmizləmək, qəlbin pərdə təbəqələrini qaldırmaq və beləcə, elm mənbələrinin fışqırması da, mümkündür.

**Sual:**

Boş olan qəlbdən, necə elm fışqıra bilər ki?!

**Cavab:**

Bu məsələ də, qəlbin qeyr-i adi sirlərindəndir. Bunun, burda bildirilməsinə xoş görü göstərilməz, sadəcə bu qədərinə toxunulmasına göz yumular:

Əşyaların həqiqətləri, Lövh-i Məhfuzda, hətta muqarrəb (Allaha yaxın) mələklərin, qəlblərində də yazılıdır.

Bir mühəndis, tikəcəyi binanın proyektini, necə ki, ilk əvvəl kağıza yazır, proyektini cızır, sonra buradan, proyekti doğrultusunda binasını meydana gətirirsə, göyləri və yerləri yaradan Xaliq Taala, kainatı

başından sonuna qədər, Lövh-i Məhfuza yazmış, ardından bu proyekt doğrultusunda, vücud (varlıq) aləminə çıxartmışdır. Varlıq qazanan bu kainatın, hiss və xəyal aləminə, digər bir surəti yansıyır.

Söz gəlişi, biri, göylərə və yer üzünə baxdıqdan sonra, gözlərini yumsa, bu yerləri seyr edirmiş kimi, xəyalında göy və yer üzünü görər. Göylər və yer üzü yox olub, fərz edək ki, özü qalsa, xəyalında, göy ilə yerin varlıqları davam edər, sanki onları seyr edirmiş, onlara baxırmış kimi olar. Sonra bu xəyali görüntüsü, qəlbinə keçir və hiss və xəyal aləminə girən nəsnələrin həqiqətləri, burda reallaşır. Qəlbdə meydana gələn bu fakt, xəyalda meydana gələn fakta uyğundur. Xəyalda gerçəkləşən isə, insanın xəyalından və qəlbindən xaric bir şəkildə, nəfsində var olan aləmə müvafiq düşər. Vücud (varlıq) qazanan aləm də, Lövh-i Məhfuzda mövcud olan proyektə müvafiq olar.

Elə anlaşılır ki, kainatın var olmasında 4 dərəcə mövcuddur:

1. Lövh-i Məhfuzdakı varlığı;

Bu proyekt mərhələsi olub, fiziki varlığından əvvəldir.

2. Həqiqi varlığı;

3. Xəyaldakı mövcudluğu;

4. Əqli varlığı, yəni qəlbdə reallaşan surətinin mövcudluğu.

Bu varlıqların bir qismi ruhani, bir qismi də cismanidir. Ruhani olanlar, öz aralarında çox incə mərhələləri meydana gətirirlər. Bu lütf, İlahi hikmətin bir gərəyidir. Çünki göz bəbəyinin kiçikliyinə rəğmən, Allah onu, elə bir şəkildə yaratmışdır ki, o genişliklərinə rəğmən aləmin, göylərin və yerlərin bir surəti, burda yazılar və hisdəki varlığından xəyal aləminə doğru bir varlıq axar, ordan da qəlbdə bir varlığı meydana gələr. Sən, sadəcə sənə çatanı bilir, bunun xaricində

isə, heç bir şeyin fərqində olmazsan. Əgər bütün kainatın bir misalı, sənin zatına buraxılmamış olsaydı, sənin, zatına zidd düşən şeylərdən xəbərin olmazdı.

Qəlblərdə və gözlərdə, bu qeyr-i adilikləri tədbir edib ardından gözləri və qəlbləri bu həqiqətləri anlamaqdan məhrum bıraxan Allahı təsbih edirəm. Subhanallah! Həqiqətən, insanların çoxu, öz nəfslərinin mahiyyətlərindən və qeyr-i adiliklərindən xəbərsizdirlər.

Biz, güdülən məqsədə dönür və belə deyirik:

Necə ki, gözdə günəşin surəti:

• bəzən günəşə baxmaqla;

• bəzən də tam günəşin qarşısında duran, günəşin surətini öz üzərində göstərən suya baxmaq surətilə reallaşırsa,

Qəlbdə də, bəzən hiss və bəzən də, Lövh-i məhfuzdan olan yansımalarla, kainatın həqiqəti meydana gəlir. Qəlbdən Lövh-i Məhfuz arasındakı pərdə qaldırıldığında, qəlb, Lövh-i Məfhuzdakı əşyanı (olacaq olanların proyektlərini) görür və ordan, doğrudan qəlbinə, doğru elm fışqırır. Dolayısı ilə, hislər yolu ilə elm əldə etməkdən müstağni (tox) olur. Bu, eynilə, yerin dərinliklərindən suyun fışqırmasına bənzəyir.

Qəlb, hislər vasitəsilə idrak edilən xüsusi şeylərdən meydana gələn xəyalların arxasına düşdüyündə, bunlara yönəldiyində, bunlar, Lövh-i Məhfuzdakı proyektləri görməsini, mütaliə etməsini əngəlləyir. Bu, eynilə çay yataqlarında toplanan suların, yerdən su fışqırmasını əngəlləməsini xatırladır. Yenə belə biri, günəşin sudakı yansımasına baxıb, günəşə baxmayan kimidir. Çox təbiidir ki, günəşin sudakı yansımasına baxan, günəşə baxmış sayılmaz.

Elə isə, qəlbin 2 qapısı vardır:

1. Lövh-i Məhfuz və mələklər aləmindən ibarət olan mələkut aləminə açılan qapısı;

2. Mülk və şəhadət aləminə aid olan 5 hissə açılan qapısı.

Şəhadət və mülk aləmi də, öz üzərində, bir cəhətdən mələkut aləmini yansıdır. Qəlbin, hiss orqanlarına açılan qapısının burdan necə faydalandığını bilirsən.

Ancaq qəlbin mələkut aləminə açılan daxili qapısını, Lövh-i Məhfuzu mütaliə etməsini, hisslərə ehtiyac duymadan, bunlardan faydalanmadan gördüyün yuxuların qəribəlikləri üzərində düşünmək və qəlbin yuxuda gələcəklə bağlı hadisələri və ya keçmişdə reallaşmış hadisələri müşahidə etməsilə qəti şəkildə öyrənə bilərsən. Bu qapı, özünü, tamamilə Allah Taalanın zikrinə vermiş şəxslərə açılır.

Bir dəfə Allah rəsulu (sallallahu aleyhi və səlləm):

***“Müfərridlər irəliləyib getdilər.”***

***buyurunca, Səhabələr:***

***“Ey Allahın rəsulu! Müfərridlər kimlərdir?”***

***deyə soruşdular. Bunun üzərinə Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə cavab verdi:***

***“Allahı zikr etməklə təmizlənən kimsələrdir. Zikir, bunların çiyinlərindən günahlarını endirmişdir. Qiyamət günü, Allahın hüzuruna xəfif, günahsız olaraq vararlar.”***

Allah rəsulu (sallallahu aleyhi və səlləm) daha sonra, müfərridlərin kimlər olduğu mövzusunda, Allah Taalanın belə buyurduğunu nəql edir:

***“Sonra Mən, üzümlə özünə yönəldiyim kimsəyə vermək istədiyimi, hər hansı bir şəxs əldə edə bilərmi? Onlara ilk verəcəyim, qəlblərinə nur atmağımdır. Bu sayədə, Mən, özlərindən necə xəbərlər verərsəm, onlar da Məndən elə elmlər nəql edərlər.”***

Bu xəbərlərin giriş nöqtələri, daxili qapıdır. Demək ki, vəli və peyğəmbərlərin elmlərilə, alim və müdriklərin elmləri arasında fərqlər vardır:

• **Birincilərin elmləri:** qəlbin mələkut aləminə açılan daxili qapısından gələrkən;

• **İkincilərin elmləri:** mülk aləminə açılan hislər qapılarından gəlməkdədir

Qəlbin, kainatın qeyr-i adilikləri, görünən və görünməyən aləmlər arasında gedib-gəlməsinin müamələ elmində bütün təfərrüatı ilə açıqlanması, mümkün deyildir. Yuxarıda verdiyimiz nümunə, 2 aləmin giriş nöqtələri arasındakı fərqi sənə öyrətməkdədir.

• **İkinci nümunə:**

Bu nümunə, sənə, alimlər ilə vəlilərin əməlləri arasındakı fərqi göstərəcək. Alimlər, elmlərin özlərini qazanıb bunları qəlbə ötürməklə məşğuldurlar. Sufilərin övliyaları isə, sadəcə qəlblərini parlatmağa, qalaylamağa çalışırlar.

Hekayə edildiyinə görə, Çinli sənətkarlarla Romalı sənətkarlar, bir kralın qarşısında, öz sənətlərini tərifləyir, hər 2 tərəf, öz sənətlərinin üstün olduğunu müdafiə edirmiş.

Sonunda kral, 2 qrupu, salonun ayrı-ayrı künclərinə göndərir və bir-birilərini görməmələri üçün, aralarına bir pərdə asdırır və:

***“İndi baxaq görək, hər kəs, öz bölmələrindəki divar üzərində, sənətlərini necə icra edəcəklər?!”*** deyir.

Romalılar, hesaba gəlməyəcək şəkildə, çox fərqli boyalar toplayarkən, çinlilər, heç bir boya istifadə etməz, var gücləri ilə divarı parıldadırlar.

Romalılar, işlərini bitirincə, çinlilər:

***“Biz də bitirdik.”*** deyirlər.

Kral təəccüblənir:

***“Hər hansı bir boya istifadə etmədən, sənətlərini necə icra etmiş ola bilərlər?!”***

deyə düşünür.

Onlara:

***“Boya istifadə etmədən, işinizi necə tamamladınız?”*** deyə soruşulur.

Çinlilər:

***“Bu, sizi maraqlandırmaz. Siz, pərdəni qaldırın.”*** deyirlər.

Pərdəni qaldırdıqlarında, çinlilərin tərəfində, romalı sənətkarların sənətləri, işıl-işıl parıldayır, gözləri qamaşdıran görüntülər meydana gətirir. Çinlilər divarı o qədər parlatmışdılar ki, sanki ləkəsiz bir ayna kimi olmuşdu. Füsunkar parlaqlığı ilə, onların tərəfi daha gözəl görülmüşdü.

Bax, qəlblərini təmizləmə, parlatmaq xüsusunda, vəlilər də, eyni himməti göstərirlər və nəticədə, Romalıların naxışları, çinlilərin divarlarına yansıdığı kimi, sonsuz parıltıları ilə, Haqqın təcəlliləri,

qəlblərdə parıldamağa başlayar.

Alimlərin çalışmaları, qəlblərinə elm nəqş etmələri, Romalıların çalışmalarını xatırladır.

Hal nə olursa olsun, möminin qəlbi ölməz. Ölümü sırasında, elmi yox olmaz, duruluğu bulanmaz. Bu həqiqətə, Hasan əl-Basri, bu sözlərilə işarət etmişdir:

***"Torpaq, imanın olduğu yeri yeməz. Bura (qəlb), Allaha yaxınlaşma vəsiləsidir."***

Əldə edilən elmə və elmi qəbul üçün saflıq və istedad təminincə gəlincə isə, kimsə bundan müstağni (tox) ola bilməz. İnsanın səadəti, elm və mərifətlə reallaşır. Çox təbii, xoşbəxtliklər, bir-birilərinə nisbətlə üstünlük göstərirlər.

Söz gəlişi, pulu olan, varlı sayılır, ancaq qorxunc xəzinələrə sahib olan, daha çox varlı sayılır. Səid (xoşbəxt) kimsələrin dərəcələrinin fərqlilikləri, mərifət və imandakı fərqliliklərilə mütənasibdir. Necə ki, varlıların da mallarının azlığı və çoxluğuna görə siniflərə ayrıldıqları da, bir vaqiədir.

Mərifətlər, nurlardır. Möminlər, ancaq nurları ilə mütənasib olaraq, Allaha yaxınlaşarlar.

***"O gün sən mömin kişilərin və mömin qadınların nurunun onların önlərindən və sağ tərəflərindən yayıldığını görəcəksən. Onlara: "Bu gün sizin müjdəniz ağacları altından çaylar axan Cənnət bağlarıdır. Siz orada əbədi qalacaqsınız!"– deyiləcək. Bu, böyük uğurdur." (Hədid/12)***

Bir hədisdə, belə buyurulmuşdur:

***“Möminlərin bəzilərinə dağ kimi nur verilərkən, bəzilərinə də, daha kiçiyi bəxş ediləcək. Ən son şəxsin ayaq barmaqları üzərində, bir işıq olacaq və bu, gah önünü aydınladacaq, gah sönəcək. Aydınlandığında, o şəxs, 2 ayağını da irəli ataraq yeriyəcək. İşıq söndüyündə isə, yerində gözləyəcək.***

***Möminlər, sirat körpüsündən, nurlarına görə keçəcəklər:***

- ***Bəziləri göz qırpılacaq bir müddətdə;***
- ***Bəziləri şimşək surətilə;***
- ***Bəziləri bulud axışı;***
- ***Bəziləri ulduz düşməsi kimi;***
- ***Bəziləri yarış meydanlarında qaçan at surətilə***

***keçəcəklər. Ayaq barmaqları üzərində işıq olan şəxs, üzü üstə, sürünə-sürünə keçməyə çalışacaq. Bir əlini irəli atarkən, digər əlilə tutacaq, ətrafında atəşlər hücum edəcək və bu şəkildə, sürünə-sürünə sonunda qurtulacaq.”***

Bu hədis də, insanların iman xüsusunda fərqli mövqelərdə olduqlarını göstərməkdədir. Necə ki, Allah rəsulu (sallallahu aleyhi və səlləm)’in şəhadətinə görə, əbu Bəkrin imanı,

-peyğəmbərlər xaric- bütün məxluqatın imanları ilə müqayisə edilsə, onun imanı, hamısının imanından ağır gələr.

Bu, bu sözlə eyni mənadadır:

Günəşin işığı, bütün aydınlıq verən şeylərin işıqları ilə qarşılaşdırılarsa, günəşin işığı, hamısını örtər:

• Xalq təbəqələrinə mənsub şəxslərin bəzilərinin imanlarının nurları- qəndil (lampa);

• Bəzilərinki mum işığı ikən;

• Siddiq kimsələrin imanlarının aydınlığı, ay və ulduzların aydınlıqları kimidir.

• Peyğəmbərlərin imanı isə, günəşi xatırladır.

√ Günəş işığının aydınlığında, o böyük genişliyinə rəğmən, üfüq necə aydınlanır; və

√ Bir lampanın işığında da, sadəcə evin bir küncü işığa qovuşursa;

√ Qəlbin mərifətlərlə inşirahı, açılması da, eyni şəkildə fərqlilik göstərir.

Mələkut aləminin dərinliyi, arif kimsələrin qəlblərinə açılır. Bundan ötürüdür ki, bir hədisdə belə buyurulmuşdur:

***"Qiyamət günü, belə deyiləcək:***

***Qəlbində zərrə qədər, zərrənin yarısı qədər, bir misqalın 1/4-i qədər, bir arpa qədər iman olan şəxsi, atəşdən çıxarın."***

Bütün bunlar, iman dərəcələrinin fərqliliklərini göstərməkdədir. Bu miqdardakı imanlar, cəhənnəmə girməyi əngəlləməzlər. Bu hədisin məfhumundan, bir misqaldan çox imanları olanların cəhənnəmə girməyəcəyi mənası da vardır. Çünki bir misqal ağırlığında imanı olan şəxs, cəhənnəmə girmiş olsaydı, ilk əvvəl onun çıxarılması əmr edilərdi. Qəlbində zərrə ağırlığı qədər iman olan şəxs, cəhənnəmə girsə də, orda əbədi qalmağa layiq görülməz. Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in bu sözləri də, bu mənadadır:

***"Mömin insandan başqa, 1000 mislindən daha xeyirli heç bir şey***

***yoxdur."***

Bu sözlərdə, yəqin dərəcəsində iman sahibi olan arif billah (Allahı tanıyan) şəxsin qəlbinin üstünlüyünə işarət vardır. Belə birinin qəlbi, avam təbəqəsindən 1000 nəfərin qəlbindən daha xeyirlidir.

Allah Taala, belə buyurur:

***"Acizlik göstərməyin və kədərlənməyin. Möminsinizsə, daha üstünsünüz." (Al-i İmran/139)***

Bu ayətdə də, möminlər, müsəlmanlardan üstün tutulmuşdur. Çox təbii, burda işarət edilən mömin, təqlidçi möminlər deyil, arif billah olan möminlərdir.

***"Ey iman gətirənlər! Sizə: "Məclislərdə yer verin!"– deyildikdə yer verin ki, Allah da sizə geniş yer versin. Habelə sizə: "Qalxın!"– deyildikdə qalxın ki, Allah da sizdən iman gətirənlərin və özlərinə elm verilmiş kimsələrin dərəcələrini ucaltsın. Allah nə etdiklərinizdən xəbərdardır.» (Mücadilə/11)***

Burda Allah, iman edənlərlə, elmsiz olaraq təsdiq edən şəxsləri qəsd etmiş və bunları, özlərinə elm verilənlərdən ayırmışdır. Bu bölgü təsdiqi, bəsirət və kəşfə dayanmasa da, mömin isminin təqlidçi inanc sahibinə də verilə biləcəyini göstərməkdədir.

Abdullah ibni Abbas (radiyallahu anh):

***"...Özlərinə elm verilənlərə, dərəcələr vardır..."***

ayətinin təfsirində belə demişdir:

***"Allah, alimi, mömindən 700 dərəcə üstə çıxarar. Hər 2 dərəcə arasında, göylə yer arası qədər bir məsafə vardır."***

Nəbi (sallallahu aleyhi və sələm) belə buyurmuşdur:

• ***"Cənnət xalqının əksəriyyəti, əbləhlərdir. İlliyyun məqamı, ağıl sahiblərinə aiddir."***

• ***"Alimin abidə üstünlüyü, Mənim, səhabələrimdən ən kiçik bir adama üstünlüyüm kimidir."***

• Bir başqa rəvayətdə, təşbih, belə edilmişdir:

***"Alimin abidə üstünlüyü, ayın 14-cü gecəsindəki ayın, digər ulduzlara üstünlüyü kimidir."***

Bu şahid və dəlillər, cənnətliklərin dərəcələrinin, qəlblərinin və mərifətlərinin fərqliliklərinə görə, fərqlilik göstərəcəyini, çox açıq bir şəkildə, önümüzə sərməkdədir.

Bunun üçündür ki, qiyamət günü, Təğabun, aldanma günü olaraq da adlandırılmışdır. Çünki Allahın rəhmətindən yoxsul qalmaq, böyük aldanış və zərərdir.

Rəhmətdən məhrum olan kimsə, öz dərəcəsinin üstündə çox böyük dərəcələr olduğunu görəcək və bu yerlərə, 10 dirhəmi olan şəxsin, şərqdən qərbə qədər hər yerdə malı-mülk olan varlıya baxması kimi baxacaq.

Bəli, 10 dirhəmi olan da varlı sayılır. Ancaq ikisi arasında fərq, nə qədər böyükdür! Böyük zənginlikdən nəsibini almamış şəxsin aldanışı, nə qədər yamandır! Doğrusu, axirətdə daha böyük dərəcələr və daha böyük üstünlüklər vardır.

• İlham yolu ilə; və

• Bilmədiyi bir yöndən

qəlbinə kiçik bir şey doğan kəs, tasavvuf yolunun doğruluğunu bilər. Buna nail olmamış şəxs də, belə bir şeyin olacağına inanmalıdır.

Çünki bu yolla təmin edilən elm, həqiqətən çox nadirdir. Şəri dəlillər, təcrübələr və hekayələr, belə bir elmin imkanına şahidlik etməkdədir.

• Allah Taala buyurur:

***“Uğrumuzda cihad edənləri mütləq Öz yolumuza yönəldəcəyik. Şübhəsiz ki, Allah xeyirxah əməl sahibləriləd***ir.” (Ənkəbut/69)***

Elm əldə etmədən sadəcə ibadətlərə davam etmək surətilə qəlbdə meydana gələn hər hikmət, kəşf və ilham yolu ilə təmin edilir.

• Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurur:

***“Hər kim bildiyi ilə əməl edərsə, Allah, ona, bilmədiyi şeylərin elmini bəxş edər və yenə onu, əməl etdiyi şeylərdə müvəffəq edərək cənnəti qazandırar.***

***Bildikləri ilə əməl etməyən isə, bildiyi mövzularda çaşar, etdiklərində müvəffəqiyyət qazanmaz və bu səbəbdən cəhənnəmi qazanar.”***

***...Allahdan qorxana, Allah çıxış yolu göstərər (yəni onu, müşküllərdən qurtarar). Və ona təsəvvürünə gətirmədiyi bir yerdən ruzi bəxş edər (yəni ona, təhsil əldə etmədən, elm verər, təcrübə sahibi olmasa belə, hadisələrə nüfuz etdirər)... (Talaq/2-3)***

***“Ey iman gətirənlər! Əgər Allahdan qorxsanız, O sizə haqla nahaqqı ayırd edəcək bir anlayış verər, günahlarınızdan keçər və sizi bağışlayar. Allah böyük lütf sahibidir.” (Ənfal/29)***

Bu ayətin təfsirində:

***“Allah Taalanın verəcəyi nurun, haqqı batildən ayıran və sayəsində şübhələrdən sıyrılan bir nur olduğu bildirilmişdir.”***

Bundan dolayıdır ki, Allah rəsulu (sallallahu aleyhi və səlləm), dualarında, mütəmadiyən nur istəyir və belə niyaz edirdi:

***“Allahım! Mənə nur ver, nurumu artır, qəlbimdə mənim üçün nur yarat, qəbrimə nur qoy, qulağıma nur, gözümə nur, tükümə, dərimə, ətimə, qanıma və sümüklərimə nur qoy.”***

• Nəbi (sallallahu aleyhi və səlləm)’dən:

***“Məgər Allahın, köksünü İslam üçün açdığı və Rəbbinin nura yönəltdiyi şəxs kafirlə eyni ola bilərmi? Qəlbi Allahın Zikrinə qarşı sərt olanların vay halına! Onlar həqiqətən azğınlıq içindədirlər.” (Zümər/22)***

ayəti haqqında:

***“Ey Allahın rəsulu! Bu şərh, açma nə deməkdir?”***

soruşuldu. O (sallallahu aleyhi və səlləm) belə cavab verdi:

***“O, bir genişlətmədir. Nur, qəlbə buraxıldığında, sinə genişlənib açılar.”***

• Allah rəsulu (sallallahu aleyhi və səlləm), ibn Abbas haqqında belə dua etmişdi:

***“Allahım! Onu dində fəqih qıl və ona təvili öyrət.”***

• Əli (radiyallahu anh) belə deyir:

***“Allah rəsulu, biz əhl-i beytə sirr olaraq verdiyi heç bir şey yoxdur. Sadəcə Allah Taalanın kitabını anlamaq mövzusunda bir quluna bir lütfü olacaq, o, təhsil əldə etmədən kitabı çox gözəl anlayacaq.”***

• Allah Taalanın:

***“Allah istədiyi kəsə hikmət bəxş edir. Kimə hikmət verilmişsə, ona çoxlu xeyir nəsib edilmişdir. Bunu isə ancaq düşüncəli insanlar anlayarlar.” (Bəqərə/269)***

ayətinin təfsirində, “hikmət”dən məqsəd: Allahın kitabını başa düşməkdir, deyilmişdir.

• Bir digər ayət:

***“Biz, o hökmü, Süleymana fəhm etdirdik (qavratdıq)...” (Ənbiya/79)***

Bu ayətdə də, Süleyman (əleyhissəlam)’a, kəşf yolu ilə açıqlanan məna “fəhm, anlayış, qavrama” ismi ilə, xüsusilə ifadə edilmişdir.

• Əbu’d-Dərda (radiyallahu anh) belə deyirdi:

***“Mömin, çox incə pərdənin arxasından Allahın nuru ilə baxan kimsədir. And olsun, onun baxışı haqdır, Allah, o haqqı, onların qəlblərinə buraxar və ardından da, onu dillərilə söylətdirər.”***

• Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurur:

***“Mömininin fərasətindən çəkinin. Çünki o, Allah Taalanın nuru ilə baxar.”***

Bu həqiqətə, bu ayətdə də işarət olunmuşdur:

***“Şübhəsiz ki, bunda görə bilənlər üçün dəlillər vardır.” (Hicr/75)***

Yenə Allahın bu ifadələrində də, bu həqiqət vurğulanmışdır:

***“...Biz, yəqinliklə inanan bir xalqa dəlillərimizi bəyan etmişik.” (Bəqərə/118)***

• Nəbi (sallallahu aleyhi və səlləm) belə buyurur:

***“Elm, ikidir. Biri qəlbdəki batin elmi olub faydalı olan, odur.”***

• Alimlərdən birindən soruşuldu:

***“Batin elmi nədir?”***

O, cavab verdi:

***"O, Allahın sirlərindən bir sirdir, onu sevdiklərinin qəlblərinə buraxar və ona, nə bir mələyi, nə də bir insanı vaqif qılar."***

• Nəbi (sallallahu aleyhi və səlləm) belə buyurur:

***"Əvvəlki ümmətlər arasında muhaddəs kimsələr vardı. Əgər Mənim ümmətim arasında belə biri varsa, şübhəsiz ki, o, Ömərdir."***

İbn Abbas (Həcc surəsi 52-ci ayətdə keçən: «və lə nəbiyyin» buyuruğunu):

***"...bir peyğəmbər və bir muhaddəs..."*** deyərək ("bir muhaddəs" ləfzini əlavə edərək) oxumuşdur.

**Muhaddəs demək:** ilham edilmiş siddiq kimsələr deməkdir. İlham isə, həqiqətlərin orqanlar kanalı ilə xarici aləmdən deyil, daxili tərəfdən qəlbin içinə buraxılması, həqiqətlərin kəşf edilməsidir.

• Quran-i Kərim, çox açıq bir şəkildə, təqvanın, hidayət və kəşfin açarı olduğunu xəbər verməkdədir. Bu da, təhsil əldə etmədən, elmə nail olmaqdır:

***"Doğrudan da, gecə ilə gündüzün bir-birini əvəz etməsində, Allahın göylərdə və yerdə yaratdıqlarında, Allahdan qorxan adamlar üçün dəlillər vardır." (Yunus/6)***

Ayətdən də göründüyü kimi, ibrət alma xislətini, Özündən çəkinənlərə (qorxanlara) təxsis etmişdir.

• əbu Yezid (Bistami) və başqaları belə deyirlərdi:

***"Alim, bir kitabdan bir şey əzbərlədikdən sonra unutduğunda, cahil mövqeyinə düşən şəxs deyildir. Alim, elmini əzbərləmədən, təhsil əldə etmədən, istədiyi anda Rəbbindən alan şəxsdir."***

Bax bu elm, “Rabbani elm”dir. Bu elmə, Allah Taalanın bu sözlərilə işarət edilmişdir:

***“Onlar, orada, Öz tərəfimizdən mərhəmət bəxş etdiyimiz və elm öyrətdiyimiz qullarımızdan birinə rast gəldilər.” (Kəhf/65)***

Əslində, bütün elmlər, Allah qatından gəlir. Ancaq bir qismi, insanların təliminə, təhsilinə dayandığı üçün, bunlara: ***“ledünni elmlər”*** adı verilməz. Ledünni elm, adət edilmiş xarici təsirlərdən uzaq bir şəkildə, qəlbin gizli dünyalarına açılan elmdir.

Bax bunlar, nəqli dəlillərdir. Nəqli dəlillərin mövzu ilə bağlı ayət və hədislərinin hamısını sıralayacaq olarsaq, hədd-hesaba sığmaz.

Təhsil əldə etmədən ledünni elmə nail olmuş şəxslərin çoxluğunu, təcrübələrə söykənən müşahidələr də ortaya qoymaqdadır və bunlar, sayıla bilməyəcək qədər çoxdur. Bu, səhabələr ilə tabiun və onlardan sonra gələn nəsillər arasında görülmüşdür. Bəzi nümunələr:

• əbu Bəkr Siddiq (radiyallahu anh), ölüm döşəyində, qızı Aişə (radiyallahu anha)’ya:

***“O sənin bacın...”*** deyir. O vaxt isə, əbu Bəkr (radiyallahu anh)’ın xanımı hamilə imiş. Əbu Bəkrin ölümündən sonra, xanımı qız övlad dünyaya gətirmiş və əbu Bəkr, xanımının qız övlad dünyaya gətirəcəyini bilmişdi.

• Ömər (radiyallahu anh) da, bir xütbəsində, anidən:

***“Ey Sariyə! Dağa çəkil, dağa çəkil!”*** deyə səslənmiş və daha sonra hadisə aydınlığa qovuşduğunda, o anda çox uzaq bir bölgədə düşmənlə döyüşən İslam ordusunun tam hücumuna uğramaq üzərə ikən, Allah, bu halı Ömərə göstərmiş və Ömər də, ordu komandirinə səslənib dağa çəkilməsini bildirmişdir. Ömərin səsinin yüzlərlə km uzaqlardan

eşidilməsi, böyük kəramətlər meyanında dəyərləndirilir.

• Ənəs b. Malik (radiyallahu anh) belə deyir:

Bir dəfə Osmanı ziyarətə getmişdim. Gedərkən yolda, bir qadın gördüm, göz ucu ilə baxdım, gözəlliyinə qapıldım. Osmanın hüzuruna çıxdığımda:

***"Yanımıza, gözlərində zina əlamətləri görünən biri gəlir! Gözlərin zinasının, baxmaq olduğunu bilmirsənmi? Ya tövbə edərsən, ya da səni cəzalandıraram."*** dedi.

Mən:

***"Peyğəmbərdən sonra hələ vəhy vardırmı?" (Yəni bunu hardan bilirsən?)***

O:

***"Xeyr. Vəhy yoxdur. Ancaq bəsirət, burhan və hədəfdən yayınmayan bir sezgi vardır."***

deyə açıqladı.

• əbu Səid əl-Harraz belə deyir:

Bir dəfə, Məscidu'l-Harama getdiyimdə, çiynində 2 xirqə olan bir yoxsul gördüm. Öz özümə:

***"Bu və bənzərləri, xalqa ağır bir yükdürlər."*** dedim.

İçimdən bu hisləri keçirdiyimdə, adam mənə tərəf dönüb:

***"Allah, içinizdən keçənləri bilir. Ona qarşı diqqətli olun!"***

deyə səsləndi. Mən həmin dəqiqə, gizlicə istiğfar edib içimdən keçirdiyim şeylərdən dolayı peşmanlıq çəkdim. Bu dəfə, o yoxsul:

***«Allah, qullarının tövbələrini qəbul edər.»***

dedi və gözümün önündən çəkilib getdi.

• Zəkəriyyə b. Davud, əbu’l-Abbas b. Məsrukun belə dediyini nəql edir:

Bir gün, xəstə, əhli çox və məişətini necə təmin etdiyini bilmədiyim əbu’l-Fazl əl-Haşimini ziyarətə getmişdim. Qalxacağım vaxt, içimdən:

***«Bu adam, necə yaşayır?»*** deyə düşündüm. Bu anda mənə:

***«Əbu’l-Abbas, o alçaq düşüncələrdən sıyrıl! Allahın gizli ehsanları vardır.»*** deyə bağırdı.

Şeyxlərin fərasət yolu ilə insanların qəlblərindən keçənləri xəbər verdiklərini bildirən hekayələr, sayıla bilməyəcək qədər çoxdur. Yenə onların:

• Xızırı görüb ona suallar ünvanlamaları;

• Qeybdən səslər eşitmələri; və

daha başqa fərqli kəramətlər göstərmələrilə bağlı rəvayətlər, hesaba sığmayacaq qədərdir.

İnkarçı kimsə, hadisələri şəxsən yaşamadıqdan sonra, hekayələr özünə bir fayda təmin etməz. Bəs necə?! Əsli inkar edən, təfərrüatı da inkar edər...

**Kəraməti inkar etməyə, kimsənin güc yetirə bilməyəcəyi, 2 qəti dəlil vardır:**

***• Birincisi:***

Doğru, gerçəkləşən yuxuların qeyr-i adilikləridir. Çünki doğru yuxu sayəsində, qeyb, insanın gözləri önünə sərilir. Yuxuda gerçəkləşən bir

şeyin, oyaq ikən gerçəkləşməsi, muhal (imkansız) olmaz. Yuxu, oyaq olmaq halından, sadəcə, hislərin keyiməsi, bunların hiss sahəsinə girən şeylərlə məşğul olmamağı nöqtəsindən ayrılır. Qaldı ki, oyaq ikən dalmış olan, daldıqları üçün eşitməyən və görməyən neçə kimsələr olduğu da, bir vaqiədir.

• ***İkincisi:***

Quranda keçdiyi üzərə, Allah rəsulu (sallallahu aleyhi və sələm)'in qeyb aləmindən və gələcəklə bağlı hadisələrdən xəbər verməsidir. Bu, peyğəmbər üçün caiz olduğuna görə, başqaları üçün də caizdir. Çünki peyğəmbər:

hadisələrin həqiqətləri, mahiyyətləri önünə sərilən və xalqı doğru yola gətirməklə vəzifələndirilən şəxsdən ibarətdir.

Elə isə, kainatda, həqiqətlərin, önünə sərilib xalqı doğru yola gətirmək vəzifəsilə mükəlləf tutulmayan bir şəxsin mövcud olması da mümkündür. Belə birinə də, peyğəmbər yox, vəli deyilir.

Peyğəmbərlərə inanıb doğru yuxuları qəbul edən şəxsin, qəlbin 2 qapısı olduğundan şübhə etməməsi, lazımdır:

***1. Xaricə açılan qapısı. Bu, xarici hiss orqanlarıdır.***

***2. Qəlbin içindən mələkut aləminə açılan qapı olub bu da ilham, qəlbə üfləmək və vəhy qapısıdır.***

Bu həqiqətləri iqrar edən (doğrulayan), elmlərin, sadəcə təhsil yolu ilə, adət edilmiş metodlarla öyrəniləcəyini, bunun xaricində bir elmin mümkün olmadığını iddia edə bilməz. Mücahidənin, elmə gedən bir yol olduğunu caiz görər.

Daha əvvəl açıqladığımız kimi, qəlb:

• qurulmuş və qapıları olan bir çadırı xatırladır. Hadisələr, bu qapılardan içəri girir.

Yenə qəlb, bir cəhətdən:

• hər tərəfdən atılan oxlara hədəf olan bir nişangah; və ya

• qarşısına qoyulan surətləri arxa-arxaya göstərən bir ayna; yaxud

• özünə doğru açılmış fərqli kanallardan suların axıdıldığı bir hovuz kimidir.

İstənilən halda, qəlbə, yeni meydana gəlmiş şəkildə nüfuz edən bu təsirlərin giriş nöqtələri:

***1. Ya hislər vasitəsilə xaricdən;***

***2. Ya da xəyal, şəhvət, qəzəb və bənzəri insan xarakterinin tərkiblərindən meydana gələn şeylərin göstəriciləri olaraq daxildəndir.***

İnsan, hislər kanalı ilə, bir şeyi idrak etdiyində, şübhəsiz bundan qəlbində bir təsir meydana gəlir. Yenə insanın şəhvəti, söz gəlişi, çox yemək və təbiətinin güclülüyü səbəbilə qabardığında, yenə bundan da qəlbində bir təsir doğur. Qəlbin belə şeyləri hiss etdirməsi əngəllənsə belə, nəfsdə reallaşan xəyal davam edir və xəyal, nəsnədən nəsnəyə keçməkdə davam edir. Xəyalın bu yönü səbəbilə də, qəlb, fərqli hallara bürünür. Qəlbin dəyişikliyə uğraması və təsirlənməsindəki mütəmadilik, həmişə bu səbəblərdəndir. Qəlbdə meydana gələn təsirlərin ən xüsusisi, xatirələrdir. Xatirələr deyərkən, qəlbdə doğan düşüncələri, xatırlamaları; bununla da, qəlbin ya yenilənmə, ya da xatırlama yolu ilə elmləri idrakını qəsd edirəm. Bunlara xatirələr deyilməsinin səbəbi, qəlbin, bu kimi elmlərdən/biliklərdən qəflətdə ikən xatırlamasıdır. Hərəkətə keçirən bu xatirələrdir. Çünki niyyət, əzm və iradə, qəlbdə niyyət edilən şeyin xatırlanmasından sonra gerçəkləşir.

Fellərin başlanğıcı isə, xatirələrdir. Xatırlamaq, arzunu; arzu, əzmi; əzm, niyyəti; niyyət də, orqanları hərəkətə keçirir.

Arzunu fəaliyyətə keçirdən xatirələr:

• nəticədə zərərə sürükləyəcək pisliklər ilə;

• axirət yurdunda fayda təmin edəcək xeyirli işlər

olmaq üzərə, 2 şeyə doğru yönləndirir.

Bunlar, 2 fərqli şey olub, 2 ayrı ismə ehtiyac duyurlar:

• Təriflə qarşılanan xatirəyə- «ilham»;

• Pislənən, yəni şərrə çağıran xatırlamağa da- «vəsvəsə»

deyilir.

Bildiyin kimi, bu xatirələr, sonradan meydana gələn şeylərdir. Sonradan meydana gələn şeyə, bir muhdis (sonradan meydana gətirən kimsə) lazımdır. Hadisələr fərqliləşdikcə, səbəblərin də fərqliliyi anlaşılır. Nəticə olaraq meydana gəlmiş hadisələri, səbəblərə bağlamaq xüsusunda, Allahın qanunundan başa düşülən bunlardır. (Yəni əşyanın yaradılışında, Allahın kainatdakı qanunu, səbəb və nəticəyə təxsis edilmiş, xas qılınmışdır).

Bəli, atəşin işığı ilə evin divarları aydınlanıb, tavanı qaranlıqlara bürünüb dumanla qap-qara olduqca, qaralmağın səbəbinin, aydınlatmanın səbəbindən fərqli olduğunu başa düşərsən...

Eynilə bunun kimi, qəlbin nurları ilə, zülmətinin (qaranlığının) 2 fərqli səbəbi vardır:

• Xeyrə çağıran xatirə səbəbinə: mələk;

• Şərrə çağıran xatirə səbəbinə də: şeytan adı verilir.

• Xeyir ilhamını qəbul üçün qəlbi hazır mövqeyə gətirən lütfə: «təvfiq» (müvəffəqiyyət)

• Şeytanın vəsvəsəsini qəbul imkanını hazırlayan təsirə də: «iğva» və «xizlan» (müvəffəqiyyətsizlik) adı verilir.

Bəli, fərqli mənalar, fərqli isimlərə ehtiyac duyurlar. Mələk, Allah Taalanın yaratdığı bir varlıqdan ibarət olub, vəzifəsi:

• qəlbə xeyir axıtmaq;

• elm təlkin etmək;

• haqqı açıqlamaq;

• xeyir vəd etmək;

• yaxşılığı əmr etməkdir.

Allah, onu, bunun üçün yaratmış, bunun üçün vəzifələndirmişdir.

Şeytan da, Allahın bir məxluqudur. Onun vəzifəsi, mələyin vəzifəsinin tam ziddidir. O:

• pisliyi, əxlaqsızlığı əmr edər;

• insan xeyrə yönəldiyində kasıblıqla qorxudar.

İlhamın qarşısında vəsvəsə; mələyin qarşısında şeytan; təvfiqin qarşında da xizlan (müvəffəqiyyətsizlik) yer alır. Bu həqiqətə, Allah Taalanın bu ayətilə işarət olunmuşdur:

***“Biz hər şeydən cüt yaratdıq ki, bəlkə, düşünüb ibrət alasınız.” (Zariyat/49)***

Allah xaric bütün varlıqlar, qarşılıqlı olaraq cütdür. Ancaq sadəcə Allah, təkdir, Onun qarşısında heç bir şey yoxdur, O, bütün cütləri

yaradan bir olan haqdır.

Qəlb, şeytan və mələk tərəfindən çəkişdirilməkdə davam edir. Necə ki, Nəbi (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

***“Qəlbdə, 2 cür düşüncə vardır:***

• **Mələkdən gələn düşüncə.** Bu, xeyri vəd etmək və haqqı doğrulamaqdır. Qəlbində belə bir şey hiss edən, bunu Allah Taaladan bilsin və Allaha həmd etsin.

• **Digəri isə**, düşməndən gələn düşüncədir. Bu da, pisliyi vəd etmək, haqqı yalanlamaq və xeyrə qarşı çıxmaqdır. Qəlbində bu hislərə rastlayan, qovulmuş şeytandan Allaha sığınsın.”

Hədisin ravisi deyir ki:

“Allah rəsulu (sallallahu aleyhi və səlləm), bunları söylədikdən sonra, Bəqərə surəsinin 268-ci ayətini oxudu:

***“Şeytan sizi yoxsulluqla qorxudur və yaramaz işlər görməyi əmr edir. Allah isə sizə Öz tərəfindən bağışlanma və mərhəmət olunacağını vəd edir. Allah hər şeyi Əhataedəndir, Biləndir.”***

Hasan əl-Basri bu hədisi izah edərkən, belə deyir:

***“Allah rəsulunun işarət etdiyi bu 2 şey, qəlbdə dolaşan 2 düşüncədir. Bunlardan biri, Allahdan gəlir, digəri düşməndən. Allah, qəlbində bir düşüncə doğduğunda, Allahdan gələni tətbiq edib düşməndən gələni rədd edən qula rəhmət etsin.”***

Qəlb, bu 2 qütb arasında çəkişdirilməyə davam etdiyindən dolayı, Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

***“Möminin qəlbi, Rəhmanın barmaqlarından 2 barmaq arasındadır.”***

Allah Taala, ət, sümük, qan və sinirlərdən meydana gələn, ucları olan barmaqları olmaqdan münəzzəhdir. Burda vurğulanan, barmağın ruhudur, barmağın çəkib-çevirmək və dəyişdirməkdəki sürət və bacarığıdır.

Sən belə, barmağı, özündən ötrü deyil, çəkib-çevirməkdəki bacarığından dolayı diqqətə alırsan, bunların sahəsinə girən işləri, özlərilə edirsən.

Allah Taala da, murad buyurduqlarını gerçəkləşdirmək üçün, mələk və şeytanı istifadə edir.

Cisimləri çəkib-çevirməkdə, barmaqlar sənin əmrinə verildiyi kimi; bunları (mələk və şeytanı), qüdrətilə qəlbləri çəkib-çevirmək xüsusunda əmrinə hazır qılmışdır...

Qəlb, əsl təbiəti gərəyi, mələyin də, şeytanın da təsirlərini bərabər şəkildə qəbula, əlverişli bir şəkildə yaradılmışdır. Təbiətində, 2 tərəfdən birini tərcih özəlliyi isə, yoxdur. Tərəflərin:

- qəlbə hakimiyyətləri;
- arzulara uyğunluğu;

şəhvətlərə söykənmək və ya bunlardan üz çevirib qarşı durmaqla reallaşır.

Məsələn, insan, qəzəb və qəzəbinin gərəyinə tabe olarsa, arzusu vasitəsilə, şeytanın hakimiyyəti ortaya çıxar və dolayısı ilə, qəlb, şeytanın yuvası, mədəni olar. Çünki nəfsani arzular, şeytanın yayılma və otlama sahələridir. Əgər insan, şəhvətlərinə qarşı dayanar, onları nəfsinə hakim qılmaz, mələklərin əxlaqlarına bənzər bir əxlaq sərgiləyərsə, qəlbi mələklərin qərargahı və onların endikləri sahə olar.

Xülasə, qəlb, şəhvət, qəzəb, tamah, uzun əməl və bənzəri həva və həvəsdən qaynaqlanan bəşəri özəlliklərdən sıyrılmadıqca, şeytanın fitlərilə, vəsvəsələrilə at oynatdığı bir sahə olmaqdan qurtula bilməz. Bundan ötürü, Peyğəmbər (sallallahu aleyhi və sələm):

***“İçinizdə heç kim yoxdur ki, onun bir şeytanı olmasın.”***

deyincə, səhabələr belə soruşurlar:

***“Ey Allahın rəsulu! Sənin də mi?”***

O (sallallahu aleyhi və səlləm):

***“Bəli, Mənim də şeytanım vardır. Ancaq Allah, ona qarşı Mənə kömək etdiyi üçün, onun şərrindən əmin-amanlıqdayam, Mənə sadəcə xeyri əmr edər.”***

buyurur.

Bunun səbəbi budur:

Şeytan, şəhvətlər vasitəsilə insan üzərində təsərrüf edir. Şəhvəti mövzusunda Allah Taalanın yardımına nail olanın şəhvəti, sadəcə məşru yollarda və gərəkdiyi ölçüdə fəaliyyət göstərir və şəhvəti, özünü pisliyə sürükləməz. Bundan dolayı, belə bir zirehə bürünmüş bir şeytan, sadəcə xeyri əmr edər.

Nəfsani istəklər gərəyi, qəlbi dünya xatirələri istila etdiyində, şeytan burda dolaşmaq üçün, sahə tapır və vəsvəsə verməyə başlayır. Ancaq qəlb, Allahı anmağa yönəldiyində, şeytan qəlbdən köçür, hərəkət sahəsi də daralır.

Bu dəfə qəlbə, mələk yönələrək ilhama başlayır. Qəlbin, döyüş sahəsində mələk orduları ilə şeytan orduları, mütəmadi olaraq müharibə halındadırlar. Bu döyüş, 2 tərəfdən birinin, qəti zəfər əldə edib qəlbdə

hakimiyyətini və qərargahını quruncaya qədər davam edir. Artıq biri qəlbə hakim olduqdan sonra, ikincisi burdan gizlicə keçib gedir.

Qəlblərin böyük əksəriyyəti, şeytanların orduları tərəfindən fəth edilmiş, bu yerləri sahiblənmişlərdir. Qəlblər, dünyanı tərcih edən və uxrəvi (axirətə aid) xatirələrdən qovan vəsvəsələr ilə, dolmuşdur.

Şeytan birliklərinin qəlbi istilalarının ilk addımları, şəhvət və arzulara tabe olmaqla başlayır. Şeytan orduları tərəfindən qəti şəkildə ələ keçirilən qəlblərin təkrar fəth edilmələrinin tək yolu, qəlbdə şeytana azuqə buraxmamaq, qəlbi, şeytanın yeyəcəklərindən təmizləməkdir. Şeytanın azuqəsi isə, həva və şəhvətlərdir. Bundan sonra da, qəlbi Allahın zikri ilə təmir etmək lazım gəlir. Çünki mələklərin izləri, Allahın zikr edildiyi yerlərdə görülür.

Cabir b. Ubeydə əl-Adəvi:

Ala b. Ziyada, sinəmdə hiss etdiyim vəsvəsələrdən şikayət etdim. Mənə belə dedi:

***«Qəlblər, oğruların girdikləri evə bənzəyirlər. Oğrular girdikləri evdə bir şey taparlarsa, onu götürüb gedərlər, yoxsa əlləri boş qayıdarlar.»***

O, bu sözlərilə həva və nəfsani istəklərdən sıyrılmış qəlblərə şeytanın girə bilməyəcəyini vurğulamışdır. Bunda ötürü, Allah Taala:

***«Əslində, Mənim ixlaslı qullarım üzərində sənin hökmranlığın olmayacaqdır. Qoruyan olaraq Rəbbin yetər". (İsra/65)*** buyurmuşdur.[1]

---

1 **(Hüccətü'l-İslam imam Ğazzali, «İhya'u-Ulumi'd-din», 1-ci kitab: «İnsan qəlbinin qeyr-i adi özəllikləri», 3-cü cild, s. 42-61)**

**Mələkut nədir? -1**

***«Beləcə, Biz, İbrahimə göylərin və yerin mələkutunu göstərirdik ki, yəqinliklə inananlardan olsun.» (Ənam/75)***

**Təfsiri:**

Ayətdəki «kəzəlikə» (beləcə) təbirindəki kəhf hərfi, təşbih üçündür. Bu isə, daha əvvəl keçmiş olan bir qeybə işarətdir. Burda daha əvvəl zikr edilən isə, İbrahim (əleyhissəlam)'ın, bütlərə ibadət etməyi, çirkin saymış olmasıdır. Bu da Onun:

***«Doğrusu, səni və qövmünü, açıq bir azğınlıq içərisində görürəm...»*** ifadəsidir. Buna görə, məna:

***«İbrahimə, bütlərə ibadət etməyin çirkinliyini göstərdiyimiz kimi, Ona göylərin və yerin mülkünü də göstəririk...»***

şəklində olur.

Burda əqli bir incəlik daha var ki, o da, budur:

Allahın cəlalının nuru, qətiliklə kəsintiyə uğramadan davamlı olaraq parlayar. Bəşəri ruhlar, arada bir pərdənin mövcud olması halı müstəsna, o nurlardan heç məhrum olmazlar. Bu pərdə isə, Allahdan başqası ilə məşğul olmaqdan başqa bir şey deyildir...

Hal belə olunca, bu maneə və pərdələr zail olub ortadan qalxdığı nisbətdə, bu İlahi təcəllilər meydana çıxar. Bundan dolayı, İbrahim (əleyhissəlam)'ın:

***"Sən, bütləri ilahmı qəbul edirsən ?" (Ənam/74)***

sözü, Allahdan başqasına ibdətlə məşğul olmağın çirkinliyinə bir

işarətdir. Çünki Allahın xaricində qalan hər şey, Allahdan uzaq qoyan bir pərdə məsabəsindədir.

Bundan dolayı, o pərdə yox olunca, şübhə yoxdur ki, "göylərin mələkutu" ona tamamilə təcəlli edər.

Bu səbəblə, Allahın:

***"Beləcə, biz, İbrahimə, göylərin və yerin mülkünü də göstərirdik..."***

buyuruğu,

***"Allahdan başqası ilə məşğul olmaq sonlandığında, Allahın cəlalının nuru, ona təcəlli etdi."*** deməkdir.

Bundan dolayı, Allahın ayətdəki təbiri də, bu şərəfli və ruhani, mənəvi faydanın qaynağı olmuş olur.

**İkinci məsələ:**

Bir kimsə belə deyə bilər:

***"Bu göstərmə işi, daha əvvəl də vardı. Bundan dolayı, əvla olan:***

***'Beləcə, biz İbrahimə göylərin və yerin mələkutunu göstərmişdik...'***

deyilməsidir. O halda, daha nəyə görə bu ləfz yerinə:

***'Beləcə biz...göstəririk...' deyilmişdir?"***

**Cavab:**

Biz deyirik ki, buna bu şəkillərdə cavab verilə bilər:

**a.** Ayətin təqdirinin:

***"Bax beləcə, biz, İbrahimə, göylərin və yerin mələkutunu***

***göstərirdik..."***

şəklində olmasıdır. Beləcə bu ifadə, keçmişin hekayəsi olur. Buna görə, məna da bu şəkildə olur:

***"Allah Taala, İbrahimin, haqq dinə son dərəcə bağlılığından dolayı, atası ilə üz-üzə son dərəcə sərt bir şəkildə danışdığını nəql edincə, sanki:***

***'İbrahim, dini salabət (qatılıq, sağlamlıq) xüsusunda bu üstün dərəcəyə necə çatmışdır?'***

deyilmiş, bunun üzərinə də:

***'O, ta büluğ yaşına vardığı zamandan bəri, qəti (yəqin) elmə çatanlardan olsun deyə, İbrahimə, uşaqlığından etibarən göylərin və yerin mülkünü göstərirdik...'***

şəklində cavab verilmişdir.

**b.** Bu, əvvəlkindən daha qiymətli bir açıqlama olub, buna görə, biz deyirik ki:

Allahın, İbrahimə göylərin və yerin mələkutunu göstərməsindəki məqsəd, İbrahimin, sırf bu mələkutu görməsi deyildir. Əksinə, bundan məqsəd, Onun o mələkutu görməsi və beləcə, ucalığının və ululuğunun mərifətinə nail olması, çatmasıdır. Halbuki Allahın məxluqatı, hər nə qədər zat və sifətləri cəhətindən sonlu və fani isələr də, bunların zatlara və sifətlərə dəlalət etmə cəhətləri, sonsuzdur...

Atam Şeyx əl-İmam Ömər Ziyauddin (rahiməhullah)'ın belə dediyini eşitdim:

"Mən, şeyx əbu'l-Qasim əl-Ənsari'nin belə dediyini eşitdim:

İmamu›l-Harameyn›in belə dediyini eşitdim:

***“Allahın məlumatı sonsuzdur. Onun, o məlumatlardan hər biri haqqındakı məlumatı da sonsuzdur. Bu, belədir, çünki tək bir atom (cövhər-i fərd)’in, bədəliyyət yolu üzərə, sonsuz yerlərdə mövcud olması ve eyni yol üzərə, sonsuz sifətlərlə vəsflənməsi, mümkündür.***

***Halbuki o təqdir və fərz edilən halların hamısı da, Allahın hikmətinə və qüdrətinə dəlalət etməkdədirlər. Cövhər-i fərd (atom) ilə bölünməyən cüz (parça) belə olunca, Allahın bütün mələkutu haqqındakı söz, necə olar?!***

***Beləcə, Allahın mülkünün və mələkutunun, Onun cəlalının sifətlərinə, əzəmət və izzətinin əlamətlərinə dəlalətinin sonsuz olduğu sabit olmuş olur.***

***Halbuki sonsuz olan məlumatların, insanların ağıllarında bir dəfədə olmaları, imkansızdır. O halda, bu məlumatları əldə etməyin yolu, bir sona varmadan, gələcəkdə bu məlumatların bir-biri ardınca meydana gəlməsilə olur...”***

Allah ən doğrusunu bilir. Biz bu səbəbdən dolayı, O:

***“Beləcə Biz, İbrahimə, göylərin və yerin mələkutunu göstərdik...”***

deməmiş, əksinə, O:

***“Beləcə Biz, İbrahimə göylərin və yerin mələkutunu göstəririk...”***

buyurmuşdur. Ki, bax bu, mühəqqiq alimlərin:

***“Allaha doğru yolçuluğun bir nəhayəti vardır; ancaq Allahda yolçuluğun bir sonu yoxdur...”***

şəklindəki sözlərindən murad edilən xüsusdur. Allah ən gözəl biləndir.

***"Mələkut" nə deməkdir?***

"əl-Mələkut", mülk deməkdir. Sondakı "tə" hərfi, mübaliğə üçün gətirilmişdir.

Bil ki, burdakı "göstərmə" felinin açıqlanması xüsusunda, 2 görüş vardır:

İbrahimə mələkutun göstərilmə keyfiyyəti:

• **Birinci görüş:** Allah Taala, İbrahimə, «mələkut»u, şəxsən gözü ilə göstərdi.

Bu görüşdə olanlar, sözlərini belə sürdürmüşlərdir:

***"Allah, İbrahim üçün, ərş, kürsi və maddə aləminin üstünün özündə sonlandığı yerə qədər olan qismi görsün deyə, səmaları (göyləri);***

***Yenə maddi aləmin özündə sonlanacağı ən son mərtəbəyə qədər olan yerləri yarıb açdı...***

***Beləcə, İbrahim (əleyhissəlam), göylərin və yerin içindəki son dərəcə heyrətləndirici və ağıllara durğunluq verən şeyləri gördü..."***

İbn Abbas (radiyallahu anh)›ın belə dediyi rəvayət edilmişdir:

***"İbrahim (əleyhissəlam), göyə yüksəldilib göydə və yerdə olanları gördüyündə, birini pis bir işlə məşğul olarkən gördü. Beləcə, həm ona, həm də digərinə, həlak olmaqları üçün dua etdi. Bunun üzərinə, Allah Taala, İbrahimə:***

***'Qullarıma ilişmə, onlar 2 hal arasındadırlar...Mən, onlardan ya təmiz bir zürriyyət xəlq edərəm; yaxud da onlar tövbə edər, Mən də onları bağışlayaram və yaxud da onların arxalarında cəhənnəmi yaradaram...'***

demişdir.”

Qadı, bu rəvayəti bu cəhətlərdən tənqid etmişdir:

**a.** Göydəkilər, muqarrəb (Allaha yaxın) mələklərdir. Halbuki onlar, Allaha (günahlarla) üsyan etməzlər. Bundan dolayı:

***“İbrahim göyə qaldırıldığında, pis bir iş görən bir qul gördü.”***

demək, uyğun düşməz.

**b.** Peyğəmbərlər, Allahın əmri olmadan, günahkar kimsənin həlak olması üçün dua etməzlər. Allah, bu xüsusda, izn verincə də, heç bir şeyin o peyğəmbərin duasının qəbul olunmasına mane olması, caiz olmaz.

**c.** Bu dua, ya doğru olar və ya yalnış. Əgər doğru olarsa, daha nəyə görə onu ikinci dəfə rədd edir? Əgər yalnış olarsa, nə üçün onu ilk səfərdə qəbul etmişdir?»

Daha sonra Qadı, sözünə belə davam edir:

“Əhəd xəbərlər, əqli dəlillərin xilafına olaraq varid olduqları zaman, o mövzuda təvaqquf etmək” (lehində və ya əleyhində bir şey söyləməmək) gərəkdir.”

------------------------------

**İbrahimin «mələkut»u görməsinin ruhani olduğunu söyləyənlər:**

• **İkinci görüş:** Bu göstərmə işi, maddi göz və zahiri hislərlə deyil, bəsirət və ağıl gözü ilə olmuşdur.

Bu görüşü müdafiə edənlər, bu şəkillərdə dəlil gətirmişlərdir:

**Birinci dəlil:**

Göylərin mələkutu, göyün mülkündən ibarətdir. Halbuki Allahın qüdrəti görülməz, ancaq ağıl ilə anlaşılar. Bu, qəti bir sözdür. Nə var ki,

***“göylərin və yerin mələkutu ilə murad edilən, göylərin və yerin şəxsən özləridir.”***

deyilə bilər. Ancaq belə olması halında da, “mələkut” ləfzi, nəzər-i etibara alınmamış və ondan daha başqa bir məna əldə edilməmiş olar.

**İkinci dəlil:**

Allah Taala, bu göstərmə işini, ayətin başında, icmal olaraq zikr etmişdir, ki, bu, Onun:

***“Beləcə, Biz, İbrahimə göstərirdik...”*** buyruğudur.

Bundan sonra da, bu göstərmə işini:

***“Gecənin qaranlığı onu bürüdükdə o, ulduz görüb...” (Ənam/76)*** ifadəsilə təfsir etmişdir.

Beləcə bu istidlalın zikr edilməsi, o göstərməni şərh və təfsir etmək üçün gətirilmiş olur. Bu səbəblə də, o göstərmə işinin, bax bu istidlaldan ibarət olduğunun söylənməsi gərəkdir.

**Üçüncü dəlil:**

Allah Taala, sonra da:

***“Bunlar, öz qövmünə qarşı İbrahimə verdiyimiz dəlillərimizdir...” (Ənam/83)*** buyurumuşdur.

Halbuki göz ilə görmək, qövmünün əleyhinə bir hüccət ola bilməz. Çünki onlar, bu hüccət göstərilərkən, orada idilər...

Yenə onlar, bu mövzuda, İbrahim (əleyhissəlam)’ı yalanlayırlardı. Onlar, ayrı bir dəlil və çox açıq bir möcüzə olmadan, o iddiada, İbrahimi

təsdiq edə bilməzlər.

İbrahimin, ulduzlarla istidlal etmə xüsusunda qövmünə qarşı gətirmiş olduğu bu hüccət, ancaq Quranın açıqlamış olduğu yol ilə olmuşdur. Çünki o dəlillər, İbrahim üçün olduğu qədər, onlar üçün də açıq bəyan idi...

**Dördüncü dəlil:**

Aləmin bütününü göstərmək, aləmin hər cür mümkinata qadir olan bir İlahının mövcud olduğu xüsusunda, zəruri bir elm/bilik ifadə edər (qəti olaraq bildirər).

Halbuki belə bir hal səbəbilə insan, mədhə və təzimə haqq qazana bilməz... Kafirlər də axirətdə Allahı zəruri olaraq biləcək və tanıyacaqlar. Halbuki onlar üçün bu tanımadan dolayı bir mükafat və bir tərif bəhs mövzusu deyildir... Ancaq yaradılanların sifətlərilə, bir Yaradıcının varlığı, Onun qüdrət və hikməti xüsusunda istidlal etməyə gəlincə, bax mədhi və təzimi gərəkdirən də, budur.

**Beşinci dəlil:**

Allah Taala, İbrahim (əleyhissəlam) haqqında:

***"Beləcə Biz, İbrahimə, göylərin və yerin mələkutunu göstərirdik..."*** buyurmuşdur.

Eynilə bunun kimi, bu ümmət haqqında da:

***"Quranın haqq olduğu onlara aydın olana qədər, Biz dəlillərimizi onlara həm kainatda, həm də onların öz nəfslərində mütləq göstərəcəyik. Məgər Rəbbinin hər şeyə şahid olması kifayət deyil?"*** **(Fussilət/53)** buyurmuşdur.

Bax bu göstərmə işi, maddi gözlə olmayıb qəlb gözü ilə olduğu

kimi, İbrahimə göstərilən şeylərin də belə olması, uzaq ehtimal deyildir.

**Altıncı dəlil:**

İbrahim (əleyhissəlam), ulduz, ay və günəş ilə istidlal etməyi tamamlayınca, bundan sonra:

***"Doğrudan da mən, hənif olaraq üzümü göyləri və yeri yaradana çevirdim. Mən müşriklərdən deyiləm".* (Ənam/79)**

demiş, beləcə də, göylərin və yerin, ulduz, ay və günəş haqqında zikr etmiş olduğu dəlildən dolayı, yaradılmış olduqlarına hökm etmişdir.

Əgər bu dəlil, bütün göylər və yer haqqında ümumi olsaydı, o vaxt, ümumi olan hökm, xüsusi bir dəlilə bina edilmiş olardı, ki, bu, yalnışdır...

Beləcə, bu dəlilin, ümumi bir dəlil olduğu sabit olmuş olur və bu səbəblə də, ulduzun, ayın və günəşin zikr edilməsi, "mələkut"un göstərilməsinin bir misalı kimi olmuş olur.

Bundan dolayı, "mələkut"un göstərilməsindən murad olunan:

-Dəyişmələri mümkün və hadis (sonradan yaradılan) varlıq olmaları səbəbilə-

bunların, alim, qadir və hakim (hikmət sahibi)...olan bir İlahın varlığına, necə dəlalət etdiklərini bildirmək olması lazımdır...

Beləcə də, bu göstərmə işi, göz ilə deyil, qəlb ilə olmuş olur.

**Yeddinci dəlil:**

«Yəqinlik», özündən əvvəl şəkk və şübhə mövcud olduğu zaman, düşünmə və təfəkkür ilə əldə edilmiş olan elmdən ibarətdir. Bundan

dolayı, Allah Taala'nın:

***«...yəqinliklə inananlardan olması üçün...»***

buyuruğu, bu göstərmə işinin, bir məqsəd və qayəsi kimi olmuş olur. Beləcə də, ayətin təqdiri və mənası:

***«...qəti elm qazansın deyə, göylərin və yerin mələkutunu göstərirdik...»*** şəklində olur.

Bundan dolayı, «yəqin», dəlildən əldə edilən elm olunca, bu göstərmənin də, edilən istidlaldan ibarət olması gərəkdir.

**Səkkizinci dəlil:**

Allah Taalanın bütün məxluqatı, eyni etibarla, Yaradıcının varlığına və qüdrətinə dəlalət etməkdədirlər. Halbuki bu məxluqlar, «muhdəs» (sonradan yaradılmış) və «mümkin» (varlığı və yoxluğu imkan daxilində olan) varlıqlardır. Hər muhdəs, mümkindir. O halda, bu varlıqlar (varlıq meydanına çıxmaq üçün) bir Yaradıcıya möhtacdırlar.

İnsan, bu tək izahı yaxşıca bilib başa düşdüyü zaman, bax bu, o kimsəyə, Yaradıcının varlığı xüsusunda istidlal etməsi (bir dəlilə dayanaraq hökm çıxarması) üçün kifayət edər...

Bundan dolayı, o kimsə, bu 2 müqəddiməni bilməklə, ağlının gözü və ağlının qulağı ilə bütün mələkutun, Başqasına möhtac olduğunu bilmiş olur. Halbuki, burdakı rüyət (görmək feli), qətiliklə zaval tapmayan (sonlanmayan), davamlı bir görmədir.

Sonra bu, insanı, Allahdan uzaq da tutmaz. Əksinə bu, qəlbin və ruhun Allah ilə məşğul olmasını təmin edər.

Maddi gözün görməsinə gəlincə, insanın, bu gözü ilə tək bir baxışla bir çox şeyi bütünü ilə görməsi, mümkün deyildir. Görmürsənmi,

yazılmış bir səhifəyə baxan hər kəs, o səhifənin ancaq tək bir kəliməsini mükəmməl və tam olaraq görə bilir?! Əgər onun baxışı, digər bir kəliməyə yönələr, gözü onunla məşğul olarsa, o vaxt da, o, əvvəlki ilk kəliməni idrak etməkdən və görməkdən məhrum olar.

Beləcə, bir çox şeyin bir baxışla görünməsinin mümkün olmadığı sabit olur. Bunun mümkün olduğu fərz edilsə belə, davamlı olmaz. Davamlı olduğu fərz edilsə də, bu, insanı Allahdan uzaq qoyar.

Bax, Allah Taala, Muhammməd (sallallahu aleyhi və səlləm)’i, göz ilə görüşə etibar etmədiyi üçün mədh edərək:

***“Peyğəmbərin gözü yayınmadı və həddi aşmadı.”* (Nəcm/17)** buyurmuşdur.

Bütün bu dəlillərlə, bu “göstərmə” işinin, maddi göz cəhətdən deyil, ağıl və qəlb cəhətindən olduğu sabit olur.

**Məzkur (zikr edilən) görməyin ruhani olmasına etiraz:**

Əgər:

***“Bu açıqlamaya görə, qəlbin görməsi, tövhid əhli olan hər kəs üçün mövcuddur. O halda, hansı səbəbdən dolayı, İbrahim (əleyhissəlam) üçün, belə bir üstünlük səbəbi olmuşdur?”***

deyə soruşularsa, belə cavab verərik:

“Bütün tövhid əhli, hər nə qədər bu dəlilin əslini bilirsələr də, bu aləmdəki hər bir məxluqda, cinslərinə, növlərinə, şəxslərinə və hallarına görə, bir İlahi hikmət mövcud olduğundan xəbərdar olmaq, ancaq böyük peyğəmbərlər üçün bəhs mövzusudur.

Bax, bundan ötürüdür ki, Allah rəsulu (sallallahu aleyhi və səlləm),

duasında:

***“Allahım, bizə hər şeyi, necə varsalar, elə göstər!”***

buyurmuşdur. Bundan dolayı, bu müşkil ortadan qalxmış olur. Allah ən doğrusunu bilir...

**“Yəqin” təbirinin mənası, “Yəqin elmi” nədir?**

**“Yəqin”**, düşünmə və təfəkkür səbəbilə, şübhə zail olduqdan sonra hasil olan bir elm (bilik) mənasındadır. Bax bundan dolayıdır ki, İlahi elm, “yəqini elm” deyə vəsf edilə bilməz. Çünki Allah Taala üçün, elmdən əvvəl bir şübhə bəhs mövzusu deyildir və bu elm, düşünmə və təfəkkür yolu ilə əldə edilməmişdir.

Bil ki, istidlal etdiyi xüsusun başlanğıcında, insanın qəlbi, bəzi cəhətlərdən şəkk və şübhə içindədir. Ancaq dəlillər, yaxşıca çoxalıb hamısı bir-birilə uyğunluq təşkil edib bir-birilərini dəstəklədiklərində, bu hal, o xüsusda, “yəqin”in meydana gəlməsinə səbəb olur.

**Bu, bir neçə cəhətdən belədir:**

**a.** Bu dəlillərdən hər birinin bir növ təsiri və gücü vardır. Bu təsir və güc getdikcə artaraq, qətiliklə zirvəyə çatır.

**b.** Felin çoxca təkrarlanması, bir mələkənin (bacarıq, məharət, ustalığın) meydana gəlməsinə səbəb olur.

Bundan dolayı, fərqli dəlilləri, eyni şeyə dəlil gətirmək, sanki bir dərsi təkrar etmək kimi olur. Çoxca təkrar isə, qəlbdən silinməyəcək çox güclü bir əzbəri təmin etdiyi kimi, burda da eyni şey baş verir.

**c.** Qəlb, istidlal sırasında (varılacaq nəticə haqqında), bir qaranlıq (yəni qərarsızlıq) içindədir.

Bundan dolayı, qəlbdə ilk dəlil ilə əldə edilən bir inanc meydana gəldiyi zaman, bu istidlalın nuru, qəlbdəki digər sifətlərin qaranlığına qarışır. Beləcə, nur və qaranlığın qarışığı olan o hal səbəbilə, qəlbdə bir şübhə meydana gəlir. İkinci bir istidlal edilincə, bunun nuru (aydınlığı), birinci hala qarışır. Beləcə, get-gedə qəlbin aydınlığı və parlaqlığı tamam olur.

Günəş doğarkən, ilk əvvəl onun işıqları görsənir. Bax bu, sabah vaxtıdır. Eynilə bu şəkildə, ilk istidlal, sabah vaxtı kimi olur. Sonra sabahın aydınlığı, günəşin get-gedə təpə nöqtəsinə yüksəlməsi səbəbilə, davamı artır. Bundan dolayı, günəş təpə nöqtəsinə (zenitə) çatdığında, aydınlıq ən mükəmməl halını alır. İnsan da belədir.

İnsan nə vaxt ki, Allahın məxluqatının mərtəbələrini çoxca düşünər və təfəkkür edərsə, onun mərifət və tövhid nurunun aydınlığı da, o nisbətdə parlaq olar.

Lakin aləmin günəşi ilə elm günəşi arasında, bu fərq vardır:

Aləmin günəşinin yüksəlməsində və işığının çoxalmasında, daha irəliyə keçə bilməyəcəyi bəlli bir sərhədi vardır. Ancaq mərifət, ağıl və tövhid günəşinin yüksəlməsinin bir nəhayəti və işığının artmasının bir sonu yoxdur.

Bax bundan dolayıdır ki, Allah Taala’nın:

***“Beləcə Biz, İbrahimə, göylərin və yerinmələkutunu göstərirdik...”***

buyuruğu: dəlil və bəyyinələrin mərtəbələrinə;

***“Yəqinliklə inananlardan (yəqin elminə çatanlardan olması) üçün...”*** ifadəsi də: təcəlli nurları ilə mərifət və tövhid günəşinin aydınlıqlarının dərəcələrinə bir işarət olmuş olur. Allah ən gözəl biləndir...[1]

1 **Fəxrəddin ər-Razi, "Məfatihu'l-Ğeyb", Ənam/75 təfsiri**

**Mələkut nədir? -2**

• *Əşya və hadisələrin iç üzü, görünməyən cəhəti, hikmət tərəfi;*

• Ruhlara və mələklərə məxsus qeyb aləmi;

• *Mülk aləmini idarə edən İlahi qanunlar*

**“Mələkut”** kəliməsi: əşyanın iç üzünü ifadə edir. Bizlər ümumi olaraq, əşyanın bizə baxan mülk cəhətini görürük. Mələkut cəhətini isə, iman nuru ilə görə bilərik.

İnsanı heyvandan ayıran ən əhəmiyyətli özəllik, ağıl sahibi olması, yaşadığı mülk aləminin iç üzünü də düşünə bilməsi, başa düşə bilməsi və ondan istifadə edə bilməsidir.

Su və torpaq, mülk aləmindən ikən; bir damla suda mövcud olan milyonlarca mikrob, bir qram torpaqda mövcud milyonlarla bakteriya, mələkutiyyətdən xəbər verməkdədir.

Maddi varlıqların görünməyən iç üzlərinə mələkut deyilsə də, mələkutiyyət deyildiyi zaman, daha çox, əşyadan cari olan qanunlar, bədənlərdə hökm edən ruhlar xatirə gəlir.

Ustad Nursi’nin “Risale-i Nur” təfsirində keçən:

***“Her şeyin içine melekut, dışına da mülk denir...” (Mesnevi-i Nuriye, “Hubab”, s. 92)***

ifadəsinə görə, bu görünən şəhadət aləmi, eyni zamanda mülk aləmidir. Görünməyən əmr aləmi isə, mələklər, axirət aləmləri kimi bütün aləmlər də, mələkut ilə ifadə edilirlər.

Bəzi alimlər, insan bədəninin mülk, ruhunun isə, mələkut olduğu ifadə edərkən; digər bir qismi, bədənin görünməyən qisimlərini də mələkut olaraq qəbul edirlər.

Buna görə:

***“Əlində hər şeyin mələkutu Olan Allah, pak və müqəddəsdir. Siz ancaq Onun hüzuruna qaytarılacaqsınız.” (Yasin/83)***

ayətini, 2 şəkildə başa düşə bilərik:

1. Hər şeyi idarə edən görünməz qanunlar, sistemlər, hamısı Allahın qüdrətindədir və Onun təqdiri ilə vəzifə görürlər. Bədəni idarə edən ruh kimi.

**2.** Heç bir məxluq, öz daxili cəhətinə əl uzada, güc çatdıra bilməz. Bizim daxilimizi də, heyvanın daxilini də, ağacın, dənizin içini də, Allah idarə etməkdədir.

İbrahim (əleyhissəlam)›a:

***“...göylərin və yerin mələkutunun göstərilməsi...”***

hadisəsinə, bu cəhətdən də baxa bilərik.

Yəni bu möhtəşəm aləmin, bir saray, bir şəhər, bir fabrik kimi asanca idarə edildiyi, Allah Taala tərəfindən İbrahim (əleyhissəlam)’a göstərilmişdir.

**Mələkutun bir başqa mənası da:**

Hadisələrin bilə bilmədiyimiz hikmət yönüdür. Məsələn, xəstəliyin mülk cəhəti, izdirab, ağrı və acılardır. Mələkut cəhəti isə:

- günahlara kəffarət olması;
- insanı mənəvi cəhətdən yüksəltməsi;
- qəlbini dünyadan axirətə;

• xalqdan Xaliqə çevirməsi

kimi, nurani meyvələrdir.

"Risale-i Nur" külliyyatında, mülk və mələkutun bu mənası da, gözəl bir şəkildə işlənməkdədir. Bunlardan bir misal:

***«...âyinenin iki vechi (yönü) gibi, herşeyin bir mülk ciheti var ki, âyinenin mülevven (rəngli) yüzüne benzer; muhtelif renklere ve hâlâta (hallara) medar (qaynaq, mənbə) ola bilir:***

***Biri melekût'tur ki, âyinenin parlak yüzüne benzer. Mülk ve zahir vechinde (yönündə), kudret-i Samedâniyenin (Saməd olan Allahın qüdrətinin) izzetine ve kemâline münâfi hâlât zidd hallar) vardır. Esbab (səbəblər), o hâlâta (hallara) hem merci (rücu edilən, dönülən yer), hem medar (qaynaq) olmak için vaz edilmişler (yerləşdirilmişlərdir).***

***Fakat melekûtiyet ve hakikat cânibinde (yönündə), herşey şeffaftır, güzeldir, kudretin bizzat mübaşeretine (şəxsən təmasına) münasiptir, izzetine münâfi (zidd) değildir..."***[1]

Məlum olduğu üzərə, aynanın 2 üzü vardır:

Parlaq üzü və rəngli üzü (yəni aynanın önü və arxası).

Rəngli üzü, çox fərqli rənglərdə ola bilər. Lakin bu fərqlilik, parlaq üzə təsir etməz.

Arxa üzünü nə qədər qatı rənglə boyasaq, ön tərəfi o dərəcə parlaq görünür.

Eynilə bunun kimi, əşyanın və hadisələrin də, 2 üzü vardır:

• Bizə baxan üzü, aynanın rəngli qisminə (arxa tərəfinə) bənzəyir. Burda fərqli rənglər və görüntülər ola bilər.

1 **Sözler, 22. Söz, 2. Makam, 1. Lema, s. 287**

• Mələkut cəhəti isə, aynanın şəffaf üzü kimidir və daim parlaqdır.

Məsələn, ölümün insana baxan üzü, qaranlıq görünə bilər. Lakin mələkut cəhətilə ölüm, insanı bu dünyadan, daha gözəl bir aləmə götürür. Bu üz parlaq və gözəldir.